QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Noyabr 2018 № 9 (1096)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ


## "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı"nın təsdiq edilməsi haqqında *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 3-cü bəndini rəhbər tutaraq, Azərbaycan Respublikası Prezidentinin 2012-ci il 29 dekabr tarixli 800 nömrəli Fərmanı ilə təsdiq edilmiş "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası"nın 7.2-ci bəndində nəzərdə tutulmuş müasir təhsil sisteminin formalaşdırılması istiqamətlərinə uyğun olaraq **qərara alıram:**

1. "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" təsdiq edilsin (əlavə olunur).

2. Azərbaycan Respublikasının Təhsil Nazirliyi:

2.1. Bu Sərəncamın 1-ci hissəsi ilə təsdiq edilmiş Dövlət Proqramında nəzərdə tutulan tədbirlərin həyata keçirilməsini əlaqələndirsin;

2.2. Dövlət Proqramının icrasının gedişi barədə ildə bir dəfə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 16 noyabr 2018-ci il*

## Professor Vilayət Əliyevin 80 illik yubileyinə həsr olunmuş tədbir

Noyabrın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Yeni Azərbaycan Partiyasının (YAP) Siyasi Şurasının üzvü, ADPU rektorunun müşaviri, filologiya üzrə elmlər doktoru, professor, Əməkdar müəllim Vilayət Əliyevin 80 illik yubileyinə həsr edilmiş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, millət vəkilləri, ölkəmizin tanınmış və nüfuzlu ziyalıları, media strukturlarının rəhbərləri, universitetin fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, müəllimləri iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov professor Vilayət Əliyevi 80 illik yubileyi münasibətilə təbrik edərək ona möhkəm cansağlığı, elmi-pedaqoji və ictimai-siyasi fəaliyyətində uğurlar arzulayıb. Qeyd edib ki, ADPU-nun dəyərli alimi Vilayət Əliyevin 80 illik yubileyinin keçirilməsi Azərbaycan elmi, təhsili, ictimai-siyasi həyatı üçün xüsusi önəm kəsb edir. Çünki professor V.Əliyev bu sahələrdə öz sözünü layiqincə demiş bir alim-ziyalıdır. Çoxsaylı kitabların, məqalələrin müəllifidir. Professor V.Əliyev müasir Azərbaycanın qurucusu, ulu öndər Heydər Əliyevə yenidən ölkəmizdə hakimiyyətə qayıtması üçün müraciət edən 91 vətənpərvər ziyalıdan biridir. Vilayət müəllim həm də gözəl, qayğıkeş ailə başçısıdır. Övladlarını cəmiyyət üçün layiqli vətəndaşlar kimi yetişdirib. Rektor tədbirdə 80 illik yubileyi münasibətilə və universitetdə uzun illər səmərəli elmi-pedaqoji fəaliyyətinə görə professor V.Əliyevə təşəkkürnamə təqdim edib.



Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov professor Vilayət Əliyevin elmi-pedaqoji və ictimai-siyasi fəaliyyəti haqqında məruzə ilə çıxış edib. Professor B.Xəlilov bildirib ki, Vilayət Hüseyn oğlu Əliyev 1938-ci il avqust ayının 23-də Şəki rayonunun Daşbulaq kəndində anadan olub. Ailəsi dəfələrlə repressiyaya məruz qalıb. 1962-ci ildə Bakı Dövlət Universitetinin Filologiya fakültəsini bitirib, elə həmin ildə Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Nəsimi adına Dilçilik İnstitutunun "Türkologiya" ixtisası üzrə aspiranturasına qəbul olunub. Tanınmış türkoloq, akademik Məmmədağa Şirəliyev Azərbaycan və özbək dillərinin müqayisəli qramatikası üzrə mövzu müəyyənləşdirib və gənc tədqiqatçıya görkəmli türkoloq, akademik Qəni Əbdürrəhmanovu elmi rəhbər məsləhət bilib. Elmi axtarışlar onu Daşkənd şəhərinə gətirib, türk dünyası ilə yaxından tanış olmağa, özbək dilini öyrənməyə imkan yaradıb. Daşkənd şəhərində çalışarkən tanınmış şair, dramaturq, professor Maqsud Şeyxzadə ilə yaxından tanış olub. Sonralar onun ikicildlik bədii irsinin Azərbaycan dilinə tərcüməsində fəal iştirak edib. Bu dostluq və Özbəkistandakı türk mühiti onun bir şəxsiyyət kimi yetişməsinə təkan verib və gənc tədqiqatçını türkçülük, azərbaycançılıq idealları ilə zənginləşdirib.

Professor V.Əliyev 1960-cı illərdən dilçilik sahəsində fəaliyyət göstərir.Onun elmi tədqiqatları Azərbaycan dilçiliyi və türkologiya ilə bağlıdır. 200-dən çox elmi məqalənin və "Azərbaycan dilində feilin təsriflənməyən formaları", "Məsdər", "Azərbaycan dilində feili sifət", "Azərbaycan dilində feilin perifrastik formaları", "Toponimika", "Azərbaycan toponimiyası" kimi kitabların müəllifidir. AMEA-nın nəşr etdirdiyi üçcildlik "Müasir Azərbaycan dili"əsərinin müəlliflərindən biridir. 1999-cu ilin iyun ayında Türkiyədə keçirilən türk dövlətləri və topluluqlarının VII qurultayında iştirak edib. Dəfələrlə Azərbaycanda və digər ölkələrdə keçirilmiş elmi konfranslarda iştirak edib. Azərbaycan Respublikası Dövlət Dil Komissiyasının üzvü olub.



Professor V.Əliyevin elmi-pedaqoji fəaliyyətinin əsas hissəsi ADPU ilə bağlıdır. 1997-2016-cı illərdə ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru vəzifəsində çalışıb. Xalqımızın görkəmli alimi, vətənpərvər ziyalısıdır. Onun ictimai-siyasi fəaliyyətində bir alim-vətəndaş mövqeyi var.

**(Davamı 2-ci səhifədə)**

## "Peşmanlıq" sənədli filminin təqdimatı

***Noyabrın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Vətəndaş Tribunası" İctimai Birliyinin Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının maliyyə dəstəyi ilə həyata keçirdiyi layihə çərçivəsində hazırlanmış "Peşmanlıq" sənədli filminin təqdimatı keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Tarix və coğrafiya fakültəsinin müəllim və tələbələri, ziyalılar, qeyri-hökumət təşkilatlarının təmsilçiləri və kütləvi informasiya vasitələrinin əməkdaşları iştirak ediblər.***



ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq bildirib ki, "Peşmanlıq" sənədli filmi gənclərimizin vətənpərvər ruhda tərbiyə edilməsi baxımından ciddi əhəmiyyət kəsb edir. Belə filmlər bizə milli tariximizi dərindən öyrənməyə kömək edir. Rektor filmin yaradıcı heyətinə təşəkkür edib və onlara uğurlar arzulayıb.

"Vətəndaş Tribunası" İctimai Birliyinin sədri, yazıçı Səfər Alışarlı tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Layihə və film barədə danışan S.Alışarlı bildirib ki, filmdə Rusiya imperatoru I Nikolayın İrəvana 1837-ci ildə etdiyi səfərindən bəhs olunur. Filmdə geniş tamaşaçı kütləsinə tanış olmayan yeni tarixi faktlar, eləcə də qədim türk torpaqlarında İran və Osmanlı imperiyası ərazilərindən köçürülən ermənilərin yerləşdirilməsi ilə bağlı mütəxəssis şərhləri öz əksini tapıb. Onun çıxışında həmçinin Rusiyanın Qafqazı işğalı zamanı Qafqazın türk-müsəlman əhalisinə qarşı yürütdüyü qəddarlıq və zorakılıq siyasəti, çarizmin ermənilərdən öz siyasi məqsədləri üçün istifadə etməsi, ermənilərin xəyanətkar hərəkətləri, imperiya əsarətinə qarşı xalq üsyanları konkret elmi-tarixi faktlar əsasında öz əksini tapıb.

Sonra "Peşmanlıq" sənədli filmi nümayiş etdirilib. Film böyük marağa səbəb olub.

Filmin nümayişindən sonra Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, tarix üzrə fəlsəfə doktoru Nazim Mustafa, filmin prodüseri Tural Cəfərov və başqaları çıxış edərək filmin müasir dövrümüz üçün mühüm ictimai-siyasi əhəmiyyət kəsb etdiyini vurğulayıblar.

**Mənsur İbrahimli**

# Professor Vilayət Əliyevin 80 illik yubileyinə həsr olunmuş tədbir

(Əvvəli 1-ci səhifədə)

Professor V.Əliyev dilimizin keşiyində dayanan, onun imkanlarına hörmətlə yanaşan, dilimizi mənəvi sərvətimiz kimi dəyərləndirən, dövlət rəmzlərindən biri kimi ona xüsusi əhəmiyyət verən, dilimizi milli varlığımızın göstəricisi kimi qiymətləndirən alimlərimizdən biridir. V.Əliyev bütün varlığı ilə türkçüdür, türk dünyasını və türkoloji düşüncəni, məfkurəni qəbul edən, təbliğ edən alimdir. İnanırıq ki, professor V.Əliyev yeni-yeni əsərləri ilə Azərbaycan dilçilik elminə dəyərli töhfələr verəcəkdir.

AMEA-nın vitse-prezidenti, Nizami adına Ədəbiyyat İnstitutunun direktoru, akademik, millət vəkili İsa Həbibbəyli, YAP-ın Səbail rayon təşkilatının sədri, millət vəkili, professor Şəmsəddin Hacıyev, Ədliyyə nazirinin müavini, general-polkovnik Məhərrəm Əliyev, millət vəkilləri Hadi Rəcəbli, Fazil Mustafa, Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqının sədr müavini Mirzə Cəfərzadə, ADPU-nun Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, Azərbaycan və dünya ədəbiyyatı kafedrasının müdiri, professor Himalay Qasımov, Müasir Azərbaycan dili kafedrasının professoru Cəfər Cəfərov,BDU-nun Türkologiya kafedrasının müdiri, professor Ramiz Əskər, Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının sədr müavini, polkovnik Cəlil Xəlilov, "Zəngəzurun səsi" qəzetinin təsisçisi Yavər Nuruyev və başqaları çıxış edərək professor V.Əliyevin görkəmli dilçi alim, milli ruhlu, dövlətə və dövlətçiliyə sədaqətlə xidmət edən vətənpərvər ziyalı olduğunu vurğulayaraq ona ən xoş arzularını bildiriblər.

Tədbirdə professor V.Əliyevə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqının Fəxri Fərmanı və "Veteran həmrəyliyi" medalı, həmçinin "Zəngəzurun səsi" qəzetinin fəxri diplomu təqdim edilib.

Sonda professor V.Əliyev çıxış edərək göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

**Orxan Abdullayev**

*Professor Vilayət Əliyevin 80 illik yubileyinə*

# VİLAYƏT

Dilin ətri gəlir əsərlərindən,
Elmin saçlarını ağardıb dən-dən.
Kitabların xəbər verir hünərdən,
Qələmin can verir daşa, Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

Vaxtında cücərsin arzunun dəni,
Silinsin yolunun dumanı, çəni,
Sevincin yox etsin dərdi, qüssəni,
Həsrət qoy gözünü yaşa, Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

Adlayıb səksəni qürurlu səslə,
Ömrünə indi də doxsanı səslə,
Alovlu həvəslə, odlu nəfəslə,
Dayan Qorqud ilə qoşa, Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

Qorun hər an cahillərin itindən,
Nadanlıq xislətdir, çıxmaz bətindən,
Xain yerə girməz xəcalətindən,
Haşa bədxahlardan, haşa, Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

Ləl, gövhər kanıdır, aç, tök sinəni,
Aqillər söz ilə vəsf etsin səni,
Hədəf et ən uca elmi zirvəni,
Oxların ötməsin boşa, Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

Razı olma elmi haqqı yesinlər,
Yerində olmasa elmi səs inlər,
Qoy ürfan mülkündə sənə desinlər,
Ey sultan Vilayət, paşa Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

Ədəb, ərkan, zəka-zər qarışıqsan,
Vətən ürfanına bir yaraşıqsan,
Təhsilə çəfəqsən, elmə işıqsan,
Qaralan üfüqə, qaşa,Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

Sənin uca adın dad verdi şeirə,
Zinətsən göylərə, bəzəksən yerə,
İlahi könlünə elə təb verə,
Dahilər önündə çaşa, Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

Qələm sirdaşındır, sarıl qələmə,
Daim üzün gülsün, qələm çək qəmə,
Doxsanı keçəndə qocaldım demə,
İlhamın sinəndə coşa, Vilayət!
Üçrəqəmli ömür yaşa, Vilayət!

**Məhərrəm Hüseynov,**
**filologiya üzrə elmlər doktoru, professor**

# Beynəlxalq elmi-praktik seminar

Noyabrın 6-da Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) Rusiya Dövlət Humanitar Universiteti (RDHU) ilə birgə "1917-1920-ci illərin mühaciratı: öyrənilməsinin və tədrisinin müasir meyilləri" mövzusunda beynəlxalq elmi-praktik seminar keçirib. Qeyd edək ki, beynəlxalq seminar "Vətən tarixi" Fondunun dəstəyi ilə "Rusiya mühacirətinin birinci dalğası Avropa ölkələrinin və xalqlarının tarix və mədəniyyətində" layihəsi çərçivəsində gerçəkləşib.

Seminarda çıxış edən dosentlər Aleksandr Levçenkov, İrina Xanova belə beynəlxalq elmi-praktik seminarların xalqların birbirinin tarixini, mədəniyyətini yaxından öyrənmələrinə kömək etdiyini bildiriblər. Çıxışlarda qeyd edilib ki, tarix elmində mübahisəli məsələlər mövcuddur. Müasir Rusiya tarixşünaslığında bu mübahisəli məsələlərin aydınlaşdırılmasına xüsusi diqqət yetirilir. Belə məsələlərdən biri də mühacirət mövzusudur. Biz xarici ölkələrdə, o cümlədən Azərbaycanda mühacirət mövzusunun araşdırılmasında, öyrənilməsində, əldə edilmiş məlumatların paylaşılmasında, Rusiyanın ali təhsil müəssisələrində tələbəgənclərə çatdırılmasında, onların bu sahə ilə bağlı bilik və təəssüratlarının artırılmasında maraqlıyıq. Çıxış edənlər seminarın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər və universitetin kollektivinə uğurlar arzulayıblar.

dir. 100 illik yubileyini qeyd etməyə hazırlaşan universitet ölkəmizin aparıcı ali təhsil müəssisələrindən biridir. ADPU-nun inkişaf etməsi üçün beynəlxalq əlaqələrin genişləndirilməsi olduqca vacibdir. ADPU bu istiqamətdə müxtəlif tədbirlər, layihələr həyata keçirir. RDHU ilə birgə keçirilən beynəlxalq elmi-praktik seminar bu baxımdan təqdirəlayiqdir. Rektor çıxışının sonunda seminar iştirakçılarına uğurlar arzulayıb.

Seminarda çıxış edən dosentinin mühacirət fəaliyyətləri barədə ətraflı və dolğun məlumat verib. Onun çıxışında Azərbaycan Xalq Cümhuriyyəti liderlərinin, o cümlədən Məhəmməd Əmin Rəsulzadənin, Əlimərdan bəy Topçubaşovun, Ceyhun Hacıbəylinin və digərlərinin müxtəlif təşkilatlar yaradaraq apardıqları mübarizə konkret elmi-tarixi faktlarla əsaslandırılıb.

Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, Tarix və coğrafiya




Seminarda ADPU-nun rəhbərliyi, tanınmış diplomat və ictimai xadim Ramiz Abutalıbov, M.V. Lomonosov adına Moskva Dövlət Universitetinin Tarix fakültəsinin Yaxın xarici ölkələr tarixi kafedrasının dosenti İsmayıl Ağakişiyev, RDHU-nun Postsovet və Regionlararası Tədqiqatları İnstitutunun Postsovet xarici ölkələri kafedrasının dosentləri Aleksandr Quşin, Aleksandr Levçenkov, İrina Xanova, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) və ali təhsil müəssisələrinin alim-mütəxəssisləri, Tarix və coğrafiya fakültəsinin müəllim və tələbələri iştirak ediblər.

Seminarı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları salamlayaraq onları rəhbərlik etdiyi universitetdə görməkdən məmnunluq duyduğunu bildirib. ADPU-nun uğurları haqqında məlumat verən rektor qeyd edib ki, bu il 566 nəfər gənc 500-dən yüksək bal toplayaraq ali təhsil almaq üçün ADPU-nu seçib. Bu, əvvəlki illərlə müqayisədə çox yüksək göstərici-

Diplomat, ictimai xadim Ramiz Abutalıbov çıxışında Azərbaycan Xalq Cümhuriyyəti liderlə-

fakültəsinin dekanı, dosent Şahin Pənahov, dosentlər Naibə Əhmədova, İradə Qasımova, Nahidə Hacinskaya, Sevinc Əliyeva, Şəlalə Həsənova, Əzizə Nəzərli, Aypara Rüstəmova mühacirət mövzusunun öyrənilməsinin ictimai-siyasi fikrin zənginləşməsinə xidmət etdiyini bildiriblər. Onlar beynəlxalq elmi-praktik seminarın aktual mövzuya həsr olunduğunu qeyd edərək bu sahədə birgə əməkdaşlıq etməyin vacibliyini vurğulayıblar.

Seminarda Avrasiya məkanında 1917-1918-ci illərin inqilabi hadisələri nəticəsində baş vermiş 1917-1920-ci illərin mühacirəti, müasir cəmiyyət və 1917-1920-ci illərin mühacirəti haqqında tarixi yaddaş, mühacirət mövzusunun Rusiyanın və Azərbaycanın ali təhsil müəssisələrində öyrənilməsinin və tədrisinin aktual məsələləri, 1917-1920-ci illərin mühacirətinin tarixi və tarixi siyasət məsələləri barədə maraqlı müzakirələr aparılıb, dəyərli fikirlər səsləndirilib.

**Günay Bağırlı**

# 9 Noyabr- Dövlət Bayrağı Gününə həsr edilmiş tədbir

Noyabrın 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) İbtidai təhsil fakültəsi üzrə təşkilatının təşəbbüsü və təşkilatçılığı ilə 9 Noyabr- Dövlət Bayrağı Gününə həsr edilmiş tədbir keçirilib. Rəsmi və bədii hissədən ibarət olan tədbirdə ADPU-nun rəhbərliyi, müəllim və tələbələri iştirak ediblər. Qeyd edək ki, tədbirin keçirilməsində Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin tələbələri də yaxından iştirak ediblər. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.

Tədbirdə çıxış edən İbtidai təhsil fakültəsinin dekanı, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov bildirib ki, 9 Noyabr - Dövlət Bayrağı Günü xalqımızın həyatında əlamətdar və müqəddəs bir gündür. Bayraq-tariximiz, keçmişimiz, bu günümüz, müqəddəs dövlət rəmzimizdir. Azərbaycan xalqı zaman-zaman öz azadlığı və müstəqilliyi uğrunda fədakar mübarizə aparıb. Xalqımız, millətimiz canı, qanı hesabına öz müstəqil dövlətini qurub, öz üçrəngli bayrağını ucaldıb. Biz bu gün bu




üçrəngli bayrağın ətrafında birləşmişik. Ümummilli liderimiz Heydər Əliyevin həyata keçirdiyi uzaqgörən və müdrik siyasət nəticəsində dövlət bayrağımız dünyanın müxtəlif mötəbər və nüfuzlu beynəlxalq təşkilatlarında, elm, mədəniyyət mərkəzlərində dalğalanıb. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin uğurla gerçəkləşdirdiyi mütərəqqi və praqmatik siyasət ölkəmizin beynəlxalq siyasi nüfuzunun yüksəlməsini, dünya birliyində öz layiqli yerini tutmasını tə-



min edib. Siz təşəbbüskar, kreativ və yenilikçisiniz. Sizə baxanda bir daha əmin oluruq ki, Azərbaycanın gələcəyi etibarlı əllərdədir.

Tədbirin bədii hissəsində tələbə-gənclərin ifa etdikləri vətənpərvər şeir və mahnılar iştirakçılarda yüksək əhvali-ruhiyyə yaradıb.

**Mahirə Mustafayeva**

# Mustafa Kamal Atatürkün anım gününə həsr edilmiş tədbir

Noyabrın 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Türk Tələbə İdarə Heyətinin təşkilatçılığı ilə universitetdə Türk dünyasının böyük oğlu, məşhur hərbi-siyasi xadimi Mustafa Kamal Atatürkün anım gününə həsr edilmiş tədbir keçirilib. Rəsmi və bədii hissədən ibarət olan tədbirdə ADPU-nun rəhbərliyi, Türk Əməkdaşlıq və Koordinasiya Agentliyinin (TİKA) Bakı Nümayəndəliyinin koordinatoru Teoman Tiryaki, Yunis Əmrə İnstitutunun rəhbəri Cihan Özdəmir, Türk Dünyası Atatürk Liseyinin müdiri Hüseyin Dəmirəl iştirak ediblər. Anım mərasimində ilk olaraq Mustafa Kamal Atatürkün və Vətən uğrunda canlarından keçmiş şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib, Azərbaycanın və Türkiyənin dövlət himnləri səsləndirilib.





Tədbirdə çıxış edən Yunis Əmrə İnstitutunun rəhbəri Cihan Özdəmir Mustafa Kamal Atatürkün anım gününə həsr edilmiş tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Cihan Özdəmir bildirib ki, dövlət quran şəxslər həmişə böyük hörmətlə xatırlanır, yad edilirlər. Mustafa Kamal Atatürk XX əsrdə dövlət quran böyük öndərlərdən biridir. Mustafa Kamal Atatürk çox çətin və mürəkkəb vəziyyətdə fəaliyyət göstərib. Osmanlı dövlətinin bacardığı qədər müqavimət göstərməsinə baxmayaraq, ölkə xarici və daxili təzyiqlər, eləcə də Birinci Dünya müharibəsinin nəticələrinə görə çökmüşdü. İnanclı, realist lider olan Mustafa Kamal Atatürk yorulmuş, gücdən və ruhdan düşmüş xalqı səfərbər edərək milli mübarizəyə başladı. Bu mübarizədə ona cəmiyyətdə tanınan, qəbul edilən, hörmət bəslənilən ziyalılar dəstək verdilər. Heç bir beynəlxalq gücün hegemonluğunu əsla qəbul etməyən, yalnız öz xalqının iradəsinə, gücünə, mətinliyinə, fədakarlığına, qəhrəmanlığına arxalanan Mustafa Kamal Atatürk bu mübarizəni qələbə ilə başa çatdırdı.

Tədbirdə Mustafa Kamal Atatürklə bağlı nümayiş etdirilən videoçarx iştirakçılar tərəfindən xüsusi maraqla qarşılanıb.

Türk Tələbə İdarə Heyətinin sədri Hakan Köse çıxışında qeyd edib ki, Türk gəncliyi Mustafa Kamal Atatürkün böyük, müqəddəs ideallarına sadiqdir və onun qurduğu dövləti yaşatmaq, daha da gücləndirmək əzmindədir.

Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin tələbələri Kadir Palalı Yusuf Dursunun "Dastan" şeirini, Mustafa Enes Aslan "Sarızeybek" rəqsini ifa ediblər. Həmin fakültənin tələbəsi Fatih Köstekçi və Filologiya fakültəsinin tələbəsi Günay Nəsirli Mustafa Kamal Atatürkün "Gəncliyə müraciəti"ni və "Türk gəncliyinin Atatürkə cavabı"nı səsləndiriblər. Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin tələbəsi Can Akar isə Mustafa Kamal Atatürkün sevdiyi musiqiləri ifa edib. Türk Dünyası Atatürk Liseyinin şagirdlərinin çıxışları, oxuduqları mahnı hamıda xoş təəssürat yaradıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Könül Nəzərova**

# Fulbrayt proqramı çərçivəsində daha bir mütəxəssis ADPU-da fəaliyyətə başladı

Noyabrın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi İngilis dili Mütəxəssisi Proqramı çərçivəsində ADPU-da fəaliyyətə başlamış ingilis dili mütəxəssisi Diane Whaley ilə görüşüb.



Qonağı salamlayan rektor ölkəmizin təhsil sistemi, universitetin tarixi, hazırda aparılan islahatlar haqqında ətraflı məlumat verdi. Professor Cəfər Cəfərov qloballaşan təhsilin ən mühüm amillərindən biri kimi ingilis dilinin əhəmiyyətindən, eyni zamanda universitetdə onun tədrisi səviyyəsinin yüksəldilməsi məqsədilə atılan addımlardan bəhs etdi. ABŞ-ın ölkəmizdəki səfirliyinin maliyyə dəstəyi və Azərbaycan Müəllim İnkişafı Mərkəzi ilə əməkdaşlıq çərçivəsində həyata keçirilən layihə, həmçinin Fulbrayt proqramı çərçivəsində ADPU-da mütəxəssislərin fəaliyyəti barədə də qonağa ətraflı məlumat verdi.

Azərbaycana ilk dəfə səfər edən mütəxəssis qısa müddət ərzində fəaliyyət göstərəcəyinə baxmayaraq, universitetin professor-müəllim heyəti ilə sıx əməkdaşlıq çərçivəsində mühüm işlər görüləcəyinə ümid etdiyini bildirdi.

Qeyd edək ki, ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi İngilis dili Mütəxəssisi Proqramı çərçivəsində mütəxəssis Diane Whaley 2018-ci ilin noyabr-dekabr aylarında ADPU-da fəaliyyət göstərəcəkdir. Bu müddət ərzində universitet rəhbərliyi, professor-müəllim heyəti və digər maraqlı tərəflərlə görüşlərin keçirilməsi, ingilis dili müəllimlərinin dərslərində iştirak, təlimlərin təşkili, həmçinin İngilis dili müəllimliyi ixtisası üzrə tədris planına dair təkliflərin verilməsi nəzərdə tutulur.

20 ilə yaxın iş təcrübəsi olan mütəxəssis müəllim hazırlığı üzrə kurikulumların hazırlanması, təlimçilərin təlimi layihələrinin həyata keçirilməsi, ali təhsilin bakalavriat və magistratura səviyyələri üzrə yerli və beynəlxalq proqramların hazırlanması kimi sahələrdə çalışmışdır. Johns Hopkins Universitetinin Beynəlxalq Araşdırmalar Məktəbində (SAİS) İngilis dili proqramının direktoru, həmçinin İngilis dili mütəxəssisi, ingilis dili tədqiqatçısı (Fellow) kimi 100-dən çox müəllim üçün təlimlər keçirmişdir. SAİS və Montevideo Universitetində fəaliyyət göstərdiyi müddətdə əsasən gənc əməkdaşların və müəllim yardımçılarının dərslərinin müşahidəsi, qiymətləndirilməsi, monitorinqi ilə məşğul olmuşdur.

Qeyd edək ki, Diane Whaley ingilis dili mütəxəssisi kimi Braziliya, Misir, Uruqvayda fəaliyyət göstərmiş, həmçinin Syracuse Universitetinin İngilis dili İnstitutu, Duke Universitetinin Fuqua Biznes Məktəbi və Sanford Dövlət Siyasəti Məktəbi, Johns Hopkins Universitetinin Beynəlxalq Araşdırmalar Məktəbində, Səudiyyə Ərəbistanında bir sıra təşkilatlarda, İstanbul Dil və Mədəniyyət Assosiasiyasında çalışmışdır.

# Türkiyə Respublikasının Azərbaycandakı Səfirliyinin təhsil müşaviri ADPU-da təhsil alan türk tələbələrlə görüşüb

Noyabrın 15-də Türkiyə Respublikasının Azərbaycandakı Səfirliyinin təhsil müşaviri Mahmut Ağırman Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) təhsil alan türk tələbələrlə və dinləyicilərlə görüşüb. Öncə təhsil müşaviri ADPU-nun rəhbərliyi ilə görüşüb, bu ali məktəbdə təhsil alan türkiyəli gənclərin vəziyyəti ilə maraqlanıb. Rektor Cəfər Cəfərov təhsil müşavirini ADPU-da görməkdən məmnunluğunu bildirib. Universitetdə gedən islahatlar, tədris prosesi, əcnəbi tələbələr, o cümlədən türk tələbələr üçün yaradılan şərait və beynəlxalq əlaqələrdən söz açıb, ADPU-nun Türkiyə universitetləri ilə əməkdaşlığının gələcək inkişaf perspektivləri barədə danışıb.



Rektorla görüşdən sonra Mahmut Ağırman tələbələrlə universitetin akt zalında görüşüb. Görüşdə təhsil müşavirinin müavini Faiq Bayramov, ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Əcnəbi tələbələrlə iş şöbəsinin müdiri Aynurə Əsgərova, Ümumi işlər üzrə prorektorun köməkçisi Turan Kərimli, Türk Tələbə İdarə Heyətinin sədri Hakan Köse və türk tələbələr iştirak ediblər.



Təhsil müşaviri Mahmut Ağırman Türkiyənin Azərbaycandakı səfiri Erkan Özoral adından bütün tələbələri salamlayıb, onlara təhsillərində uğurlar arzulayıb. O, gəlişinin məqsədinin ölkəmizdə təhsil alan türk tələbələrin problemlərini dinləmək, onları narahat edən məsələlərin çevik həllinə nail olmaq, fikir mübadiləsi aparmaq olduğunu deyib. Təhsil müşaviri tələbələrin təhsili, nizam-intizam məsələləri, miqrasiya qanunvericiliyi barədə söhbət aparıb, onları maraqlandıran sualları cavablandırıb.

Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə ADPU-da təhsil alan türk tələbələr üçün hər cür şərait yaradıldığını, onların problemlərinə həssaslıqla və qayğı ilə yanaşıldığını təhsil müşavirinin diqqətinə çatdırıb.

Sonda xatirə şəkli çəkdirilib. Mahmut Ağırman ADPU-da görüşün keçirilməsinə şərait yaradıldığına görə universitet rəhbərliyinə öz təşəkkürünü bildirib.

# ADPU-nun nəzdində ADPK-nin direktoru kollektivə təqdim olunub



Noyabrın 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) Təhsil naziri Ceyhun Bayramovun 22 noyabr 2018-ci il tarixli əmrinə əsasən Kollecin direktoru vəzifəsinə təyin olunmuş dosent İsrayıl İsgəndərov kollektivə təqdim olunub.

Təqdimatda Təhsil nazirinin müavini Məhəbbət Vəliyeva, Təhsil Nazirliyinin Aparat rəhbərinin müavini, Elm, ali və orta ixtisas təhsili şöbəsinin müdiri Yaqub Piriyev, ADPU-nun rektoru, professor Cəfər Cəfərov iştirak ediblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov dosent İsrayıl İsgəndərovu kollektivə təqdim edərək ona yeni vəzifəsində və gələcək fəaliyyətində uğurlar arzulayıb.

Təqdimatda Təhsil nazirinin müavini Məhəbbət Vəliyeva çıxış edərək ölkəmizdə təhsil sahəsində aparılan islahatlardan və qazanılan uğurlardan danışıb. ADPU-nun nəzdində ADPK-də son illər böyük uğurların əldə olunduğunu qeyd edib.

İsrayıl İsgəndərov ona göstərilən yüksək etimada görə təşəkkürünü bildirib və bu etimadı layiqincə doğruldacağını vurğulayıb.

# Doktorantların və gənc tədqiqatçıların XXII Respublika elmi konfransının açılış mərasimi

**Noyabrın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Doktorantların və gənc tədqiqatçıların XXII Respublika elmi konfransının açılış mərasimi keçirilib. Konfrans çərçivəsində öncə ADPU-nun məzunları olmuş xalqımızın dünya şöhrətli alimləri - akademik Yusif Məmmədəliyevin, akademik Zahid Xəlilovun, akademik Həsən Abdullayevin adlarını daşıyan auditoriyaların açılış mərasimi keçirilib. Auditoriyaların açılış mərasimində ümummilli lider Heydər Əliyevin 95 illik yubileyinə həsr edilmiş riyaziyyat, fizika, kimya, biologiya və informatika üzrə olimpiadaların qaliblərinə diplomlar təqdim edilib. Sonra ADPU-nun Böyük Akt zalında konfransın açılış mərasimi keçirilib. Tədbirdə Azərbaycan Respublikasının Dövlət Himni ifa edilib.**

Konfransın açılış mərasimində təhsil naziri Ceyhun Bayramov, Azərbaycan Milli Elmlər Akademiyasının prezidenti Akif Əlizadə, Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun icraçı direktoru Elçin Babayev, ali təhsil müəssisələrinin rəhbərləri, respublikanın tanınmış alimləri, doktorantlar və gənc tədqiqatçılar iştirak edib.

Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin və Birinci vitse-prezident Mehriban xanım Əliyevanın elm və təhsilə xüsusi diqqət və qayğı göstərmələri fəaliyyətimizə böyük stimul verir. ADPU-nun tədqiqat universiteti statusu alması qarşımızda dayanan əsas vəzifələrdən biridir. ADPU-da gənc tədqiqatçıların yetişdirilməsinə xüsusi diqqət yetirilir və bu istiqamətdə məqsədyönlü fəaliyyət həyata keçirilir. Konfransın gənc alimlərin elmi fəaliyyətinə təkan verəcəyini vurğulayan rektor çıxışının sonunda onlara uğurlar arzulayıb.





Təhsil naziri Ceyhun Bayramov elm, təhsil və innovasiyaların inkişafının dövlət siyasətinin əsas istiqamətlərindən biri olduğunu deyib. Nazir ölkə Prezidentinin sərəncamı ilə "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı”nın təsdiq edilməsinin doktorantların və gənc tədqiqatçıların elmi fəaliyyətinin stimullaşdırılmasına, doktorantura təhsilinin beynəlxalq standartlar əsasında qurulmasına mühüm töhfə verəcəyini qeyd edib. Bildirilib ki, “2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı” çərçivəsində indiyədək 1534 nəfər magistraturada, 547 nəfər rezidenturada, 169 nəfər doktoranturada təhsil almaq hüququ qazanıb.

Gənclərin elmi fəaliyyətə daha fəal cəlb olunması istiqamətində davamlı addımların atılmasının zəruri olduğunu vurğulayan Ceyhun Bayramov qeyd edib ki, hazırda ölkə üzrə elmlər doktoru proqramlarında təhsil alanların 8 faizini (45 nəfər) 30 yaşa qədər olan gənclər, 29 faizini isə (163 nəfər) 40 yaşa qədər olanlar təşkil edir. Nazir dövlət dəstəyi sayəsində elmlə məşğul olan gənclərin sayının artırılmasının mümkün olacağına əminliyini bildirib.



Nazir bildirib ki, Təhsil Nazirliyinin “Clarivate Analytics” ilə əməkdaşlığı nəticəsində Azərbaycan 2017-ci il üzrə “Web of Science” elmi bazasında ilk dəfə nəşr aktivliyinin son 3 il üzrə artım dinamikasına görə regionda birinci yerə çıxıb. “Web of Science” elmi bazasında 2017-ci ildə Azərbaycandan 1160 elmi tədqiqat işi qeydə alınıb ki, bu da son 25 ildə ölkə üzrə nəşr sayında rekord göstərici hesab olunur.

Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun icraçı direktoru Elçin Babayev çıxışında bildirib ki, gənclərin inkişafı, onların elmi fəaliyyətə cəlb edilməsi ölkə rəhbərliyinin diqqət mərkəzindədir. Elçin Babayev ölkəmizdə insan resurslarının inkişafı, kadr potensialı hazırlığının yüksəldilməsi sahəsində həyata keçirilən tədbirlər barədə ətraflı məlumat verib.

Tədbirdə gənc doktorantlar müxtəlif mövzularda çıxış ediblər.

Açılış mərasimindən sonra konfrans öz işini 15 bölmədə davam etdirib.

Qeyd edək ki, Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş konfrans iki gün davam edəcək. Konfransa ali təhsil müəssisələrindən və Azərbaycan Milli Elmlər Akademiyasından 500 tezis təqdim olunub. Konfransın materialları Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyası tərəfindən dissertasiyaların əsas elmi nəticələrinin dərc olunması tövsiyə edilən elmi nəşrlər siyahısına daxil ediləcək.

Doktorantların və gənc tədqiqatçıların Respublika elmi konfransı 1991-ci ildən keçirilir. Konfransın keçirilməsində əsas məqsəd elm və təhsilin inteqrasiyası, gənc alimlərin yüksəkixtisaslı kadr kimi yetişməsi sahəsində kompleks tədbirlərin həyata keçirilməsi və gənclərin elmi fəaliyyətə daha geniş miqyasda cəlb edilməsidir.

**Mahirə Məhərrəmqızı**





# Doktorantların və gənc tədqiqatçıların XXII Respublika elmi konfransının yekun iclası

Təhsil Nazirliyinin təşkilatçılığı ilə noyabrın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Doktorantların və gənc tədqiqatçıların Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş XXII Respublika elmi konfransının açılış mərasimi keçirilib. Konfransın açılış mərasimində təhsil naziri Ceyhun Bayramov, Azərbaycan Milli Elmlər Akademiyasının prezidenti, akademik Akif Əlizadə, Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun icraçı direktoru Elçin Babayev, ali təhsil müəssisələrinin rəhbərləri, respublikanın tanınmış alimləri, doktorantlar və gənc tədqiqatçılar iştirak ediblər. Açılış mərasimindən sonra konfrans öz işini 15 bölmədə davam etdirib. Noyabrın 23-də elmi konfransın yekun iclası keçirilib.

İclası giriş sözü ilə açan Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov konfransın uğurla keçdiyini vurğulayıb və ADPU-nun rəhbərliyi adından konfrans iştirakçılarına təşəkkür edərək onlara uğurlar arzulayıb.

İclasda çıxış edən bölmə rəhbərləri konfransın yüksək səviyyədə təşkil edilməsinə görə Təhsil Nazirliyinin və ADPU-nun rəhbərliyinə təşəkkür ediblər. İclasda bölmə rəhbərlərinin hesabatları dinlənilib, səmərəli müzakirələr aparılıb, dəyərli təkliflər irəli sürülüb və müvafiq qərarlar qəbul edilib. Qeyd edək ki, konfrans ölkəmizin elmi-mədəni həyatında mühüm hadisə kimi qiymətləndirilib, media tərəfindən geniş işıqlandırılıb.

**Könül Nərimanqızı**

# Tələbə Elmi Cəmiyyətinin 75-ci elmi konfransı

**Noyabrın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Elmi Cəmiyyətinin Azərbaycan Xalq Cümhuriyyətinin 100, ümummilli lider Heydər Əliyevin 95 illik yubileylərinə həsr olunmuş “Müstəqilliyimiz daimidir, əbədidir və dönməzdir” mövzusunda 75-ci elmi konfransı keçirilib. Qeyd edək ki, konfransın yüksək səviyyədə keçirilməsini təmin etmək məqsədilə ADPU-nun rektoru, professor Cəfər Cəfərovun müvafiq əmri ilə 16 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılıb. Konfransda öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.**



Konfransı giriş sözü ilə açan Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov bildirib ki, “Müstəqil Azərbaycan” deyərkən dərhal gözlərimiz önünə xalqımızın ümummilli lideri Heydər Əliyev gəlir. XX əsrdə Azərbaycan xalqı iki dəfə müstəqil dövlət qurub. Azərbaycan Xalq Cümhuriyyəti 1918-ci il may ayının 28-də yaranıb. 23 ay fəaliyyət göstərməsinə baxmayaraq, Azərbaycan Xalq Cümhuriyyəti böyük işlər həyata keçirib. Azərbaycan yenidən öz dövlət müstəqilliyini 1991-ci ildə bərpa edib. Lakin 1991-1993-cü illərdə xalqımız yenə də öz müstəqilliyini itirmək təhlükəsi ilə qarşılaşmışdı. Yalnız ulu öndər Heydər Əliyev yenidən ölkəmizdə hakimiyyətə gəldikdən sonra müstəqil dövlətimizi qorudu, gücləndirdi, onu dünya birliyində layiqincə tanıtdı. Bu gün dünyada 6 minə yaxın xalq, 200 dövlət var. Biz fəxr edirik ki, müstəqil Azərbaycan dövlətinin vətəndaşlarıyıq. Qüdrətli siyasi xadim, müdrik rəhbər Heydər Əliyev həmişə elmə, təhsilə, intellektual potensialın formalaşmasına böyük diqqət yetirib və istiqamətdə məqsədyönlü səmərəli fəaliyyət göstərib. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev elm və təhsilin inkişafına xüsusi diqqət və qayğı göstərir. Ölkə rəhbərliyi insan kapitalının inkişaf etdirilməsini əsas vəzifələrdən biri kimi qarşıya qoyub. Bizim başlıca vəzifəmiz ADPU-da elm və təhsilin inkişafının təmin edilməsi, intellektual potensialın yüksəldilməsidir. Müsbət haldır ki, son illər universitetdə elmi-tədqiqat işlərinin səviyyəsi yüksəlib, professor-müəllim heyətinin impakt-faktorlu jurnallarda dərc edilən elmi əsərlərinin sayı artıb, plagiatlığa qarşı prinspial mübarizə aparılır. Universitetin rəhbərliyi gənclərin elmi-tədqiqat işlərinə cəlb edilmələrinə, onların elmi fəaliyyətinin stimullaşdırılmasına xüsusi önəm verir. Professor A.Zamanov çıxışının sonunda konfrans iştirakçılarına uğurlar arzulayıb.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, TEC-in sədri, kimya üzrə elmlər doktoru Əli Zalov, Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev, professor Nailə Verdizadə çıxış edərək gənclərin TEC-dəki fəaliyyətini onların elmə marağının artması, formalaşması dövrü kimi səciyyələndirərək gənc tədqiqatçılara daha çox diqqətin ayrılmasını, varislik və müasirlik prinsipinin qorunmasının vacibliyini bildiriblər.



Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin tələbəsi Aslan Muradoğlu, Fizika və texnologiya fakültəsinin tələbəsi Nəzrin Babayeva və başqaları çıxış edərək belə elmi konfransların tələbə-gənclərin elmi biliklərinin artmasına, intellekt səviyyələrinin yüksəlməsinə səmərəli təsir etdiyini vurğulayıblar.

Sonra konfrans öz işini Riyaziyyat və informatika, Fizika və texnologiya, Kimya və biologiya, Tarix və coğrafiya, Musiqişünaslıq, Pedaqogika və psixologiya, Korreksiyaedici təlim bölmələrində davam etdirib. Bölmə iclaslarında ümumilikdə 226 məruzə dinlənilib, müzakirələr aparılıb.

Konfransın sonunda bölmə rəhbərlərinin hesabatları dinlənilib, yekun qərar qəbul olunub, ən yaxşı məruzəçilərə diplomlar təqdim edilib.

**Orxan Fəxrəddinoğlu**

# PEDAQOJİ FORUMUN VI DİNLƏMƏSİ

**Noyabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) himayəsi ilə təşkil edilən Pedaqoji Forumun (PF) növbəti-VI dinləməsi keçirilib. Görüşdə tanınmış tədqiqatçı alim Əhməd Qəşəmoğlu "Milli Təhsil Konsepsiyasının yaradılması zərurəti və onun mühüm prinsipləri" mövzusunda məruzə ilə çıxış edib. Dinləmədə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, professor-müəllimləri, tələbələri, ali təhsil müəssisələrinin alim-mütəxəssisləri, tanınmış ziyalılar, təhsil ekspertləri, pedaqoji ictimaiyyətin nümayəndələri, qeyri-hökumət təşkilatlarının təmsilçiləri və media nümayəndələri iştirak ediblər.**




Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov tədbiri giriş sözü ilə açaraq məruzəçi haqqında məlumat verib. Dosent E.Aslanov bildirib ki, Əhməd Qəşəmoğlu 1950-ci il fevral ayının 15-də Naxçıvan Muxtar Respublikasının Babək rayonunun Vayxır kəndində anadan olub. 1972-ci ildə Bakı Dövlət Universitetinin Mexanika-riyaziyyat fakültəsini əla qiymətlərlə bitirib və Azərbaycan Milli Elmlər Akademiyasının Kibernetika İnstitunda fəaliyyətə başlayıb. 1974-cü ildən 1978-ci ilə kimi Moskvada SSRİ EA-nın Mərkəzi İqtisadi Riyaziyyat İnstitutunda əvvəlcə təkmilləşmə kursu keçib, sonra isə aspiranturanı bitirib. 1974-cü ildə Varşavada Beynəlxalq Statistika İnstitutunun keçirdiyi konqresdə məruzə ilə çıxış edib. Sovet Sosioloqları Assosiasiyasının İdarə Heyətinin üzvü olub. Bədii yaradıcılıqla da geniş şəkildə məşğul olur. Onun şeirləri ilk dəfə 1977-ci ildə Xalq şairi Rəsul Rzanın təqdimatı ilə "Azərbaycan gəncləri" qəzetində dərc olunub. Sonra isə şeirləri, məqalələri, publisistik yazıları müntəzəm olaraq respublika mətbuatında dərc olunub. "Vurğun külək" adlı ilk şeirlər kitabı 1981-ci ildə "Gənclik" nəşriyyatında çap olunub. 1980-ci ildə Tuva MSSR-in paytaxtı Qızıl şəhərində keçirilən Gənc Yazıçıların Ümumittifaq Toplantısında lauerat olub. Buna görə də onun "Vlyublennıy veter" kitabı Moskvada "Gənc qvardiya" nəşriyyatında çap olunub. SSRİ Yazıçılar İttifaqının üzvü olub. O, eyni zamanda publisistika ilə də məşğul olur. Şeir və publisistik yazıları 10-dan çox xarici ölkədə müxtəlif dillərdə çap olunub. Rəsul Rza adına Beynəlxalq Mükafatın laureatıdır. Əhməd Qəşəmoğlu SSRİ-də riyaziyyatın sosiologiyaya tətbiqi sahəsində fəaliyyətə başlayan ilk mütəxəssislərdən biridir. 1974-cü ildə Azərbaycanda eprik sosiologiyanın əsasını qoyub. 1990-cı ildə Azərbaycanda ilk müstəqil Sosioloji Araşdırmalar Mərkəzini yaradıb. ABŞ-da, İrlandiyada, İsveçdə, Misirdə, Türkiyədə və digər ölkələrdə keçirilən 10-dan çox beynəlxalq toplantıda iştirak edib. 350-yə qədər sosioloji araşdırmanın aparılmasına rəhbərlik edib, 20-yə qədər fəaliyyət proqramının yaradıcısı, 300-ə qədər elmi, publisistik məqalənin, 5 şeir, 5 elmi kitabın müəllifidir. Əhməd Qəşəmoğlu iqtisadiyyat elmləri üzrə fəlsəfə doktoru, sosioloq, "Ahəngyol" elmi-fəlsəfi konsepsiyasının yaradıcısı, şair, publisist, Azərbaycan Yazıçılar Birliyinin üzvü və Azərbaycanın Jurnalistlər Birliyinin üzvüdür. UNESKO-nun Beynəlxalq Kadrlar Akademiyasının fəlsəfə doktoru, Azərbaycan-Hollandiya Dostluq Cəmiyyətinin, "Tərəqqi və Demokratiya" İctimai Birliyinin rəhbəridir.



Sonra Əhməd Qəşəmoğlu "Milli Təhsil Konsepsiyasının yaradılması zərurəti və onun mühüm prinsipləri" mövzusunda məruzə ilə çıxış edib. Öncə təqdimatın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edən Ə.Qəşəmoğlu vurğulayıb ki, onun məruzəsi dünyanın qabaqcıl elmi mərkəzlərinin də dəstəklədiyi "Ahəngyol" nəzəriyyəsi əsasında hazırlanıb. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na görə, təhsil sahəsi qarşısında duran əsas hədəf dünya ölkələri sırasında qabaqcıl mövqe tutan təhsil sisteminin yaradılmasıdır. Qabaqcıl mövqenin əsas meyarları isə ölkə əhalisinin, demoqrafik, iqtisadi, tarixi, mənəvi və s. potensialın xüsusiyyətlərindən, milli müstəqillik imkanlarından irəli gələn məxsusi bir təhsil sisteminin yaranmasıdır. Bu, elə təhsil sistemi olmalıdır ki, ölkəmizin və ümumiyyətlə, bəşəriyyətin tərəqqisinə kömək edə biləcək yüksəkixtisaslı, mənəviyyatlı kadrlar yetişdirsin. Elə bir təhsil sistemi yaradılmalıdır ki, hər kəs öz qabiliyyətinə, imkanlarına, üstünlük verdiyi dəyərlərə görə özünə peşə seçə bilsin. Bu peşələrin hər biri insanın həyat səviyyəsinin arzu edilən şəkildə qurulmasına imkan verməlidir. Hər kəs öz peşəsinin tələb etdiyi səviyyədə biliyə malik olmalıdır. Milli təhsil sistemi ölkənin, Yer üzünün tərəqqisinin mühüm şərtidir. Ölkə özü bir sosial sistemdir. Milli təhsil bu sistemin mahiyyətinə, mövcud xüsusiyyətlərinə uyğun olaraq yaranmış, həmin sistemin potensialını daha çox aça bilən mühüm mexanizmdir. Millli təhsil - milli ruhun, milli potensialın oyanmasına, əhatəli hərəkətverici qüvvəyə çevrilməsinə kömək edən əvəzedilməz vasitədir. Milli təhsil sistemi bəşəri dəyərlərə uyğun olaraq elə qurulmalıdır ki, həm də bütün Yer üzünün inkişafına kömək etsin. Təhsil sistemimizin qarşısında duran əsas vəzifələr ciddi planlaşdırma mexanizminin qurulması, hər bir ixtisas üzrə yalnız tələb olunan qədər mütəxəssisin hazırlanması, ölkədə hər bir insan üçün öz təyinatına, qabiliyyətinə uyğun olan potensialını açmağa imkan verən təhsil sisteminin yaradılması, hər kəsə öz qabiliyyətinə uyğun olaraq öz ixtisasını dəyişmək üçün şəraitin yaradılmasıdır. Bu gün təhsil sahəsində yeni Azərbaycan modelinin yaradılması bir tarixi, strateji, mənəvi, sosial sifarişdir. Məktəb-valideyn münasibətlərinin güclü mexanizmi yaradılmalı, ciddi, məzmunlu dərsliklər yazılmalı, xarici ölkələrin təcrübəsindən istifadə edilməlidir. Ali məktəblərdə sosial iş xidməti yaradılmalı, gələcək potensial iş yerləri ilə əlaqələr genişlənməli, ali məktəblərin fəaliyyəti dünyanın ən qabaqcıl ali məktəbləri standartlarına uyğun qurulmalıdır. İdarəetmə ancaq struktur-funksional prinsiplə həyata keçirilməlidir. Struktur və funksiya daim ahəngdar şəkildə əlaqələndirilməlidir. Müəllimin əsas resursu onun biliyi, pedaqoji təcrübəsi, tədrisetmə qabiliyyətidir. Tələbənin resursu onun bilik səviyyəsi, təhsilə olan marağı, təhsil almaq imkanlarıdır. Təhsilalanlarda milli qürur, milli kimlik, vətənpərvərlik hisslərinin humanizm prinsipləri əsasında inkişaf etdirilməsi, yüksəldilməsi olduqca vacibdir.

Tədbirdə çıxış edən təhsil ekspertləri Etibar Əliyev, Almaz Həsrət, dosentlər Zahirəli Sadıxov, Əli Zalov, Amalya Həsənova və başqaları mövzu ilə bağlı fikir və mülahizələrini bölüşüblər. Ə.Qəşəmoğlu iştirakçıların mövzu ilə bağlı suallarını da cavablandırıb.



Tədbirin sonunda çıxış edən rektor Cəfər Cəfərov maraqlı və məzmunlu təqdimata görə Ə.Qəşəmoğluna təşəkkür edib. Rektor qeyd edib ki, bu tipli tədbirlər, aparılan müzakirələr, fikir mübadiləsi universitetin həyatının canlanmasına, təhsilin keyfiyyətinin yüksəlməsinə xidmət edir və bizi qarşımıza qoyduğumuz ali məqsədlərə, strateji hədəflərə yaxınlaşdırır.

**Nurlan İftixaroğlu**

# ADPU-nun əməkdaşları Azərbaycan müəllimlərinin XV qurultayında iştirak ediblər




Azərbaycan müəllimlərinin XV qurultayı noyabrın 28-də Bakı Konqres Mərkəzində keçirilib. Tədbir iştirakçıları ümummilli lider Heydər Əliyevin, Azərbaycanın müstəqilliyi uğrunda canlarından keçmiş şəhidlərin və Azərbaycan müəllimlərinin XIV qurultayından ötən dövr ərzində vəfat etmiş təhsil işçilərinin əziz xatirələrini bir dəqiqəlik sükutla yad ediblər. Tədbirdə Prezident Administrasiyasının rəhbəri, akademik Ramiz Mehdiyev, Baş Nazirin müavini Əli Əhmədov, Milli Məclis Sədrinin müavini Bahar Muradova, dövlət və hökumət nümayəndələri, deputatlar, elm xadimləri və təhsil ictimaiyyətinin nümayəndələri iştirak ediblər. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin qurultay iştirakçılarına təbrik məktubunu Prezident Administrasiyasının Humanitar siyasət məsələləri şöbəsinin müdiri Fərəh Əliyeva oxuyub.

Hesabat məruzəsi ilə Təhsil naziri Ceyhun Bayramov çıxış edib. Sonra qurultay müxtəlif panellərdə öz işini davam edib.

**I panel:** "Ümumi təhsil: bu günə və gələcəyə baxış. Ümumi təhsilin məzmunu";

**II panel:** "Ümumi təhsil: bu günə və gələcəyə baxış. Şagird nailiyyətlərinin qiymətləndirilməsi";

**III panel:** "Ümumi təhsil: bu günə və gələcəyə baxış. Müəllim və cəmiyyət";

**IV panel:** "Ümumi təhsil: bu günə və gələcəyə baxış. Ümumi təhsilin idarə olunması";

**V panel:** "Peşəyönümü işinin təşkili və peşə təhsilinin təbliği";

**VI panel:** "Ali təhsil: mövcud vəziyyət, perspektivlər";

**VII panel:** "Təhsildə innovasiyalar" mövzularında müzakirələr aparıldı.

Altıncı paneldə ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək pedaqoji kadr hazırlığında universitetin qazandığı təcrübədən və perspektivlərdən danışıb. Qurultayın işində Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, professor Müseyib İlyasov, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, professor Mübariz Əmirov, dosent Vaqif Qurbanov və başqaları iştirak ediblər.

# Xarici ekspertin iştirakı ilə növbəti təlimlər



Müəllimlərin peşəkarlıq səviyyələrinin artırılması prosesinə dəstək məqsədilə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) xarici ekspertin iştirakı ilə növbəti təlimlərə start verilib. Belə ki, ingilis dili mütəxəssisi Diane Whaleyin moderatoru olduğu üç həftəlik təlimlər zərfinin ilk mövzusu sillabusların tərtibatına dair idi. Təlimçi ilk olaraq fənlər üzrə işçi-tədris planının strukturu, o cümlədən fənnin məqsədləri, gözlənilən tədris nəticələri, tövsiyə olunan ədəbiyyat, qiymətləndirmə və sair bu kimi məsələlərə aydınlıq gətirib.

ADPU-dan verilən məlumatda bildirilir ki, növbəti təlimlər inteqrasiya edilmiş dərs prosesində musiqidən istifadə, tədris prosesində tələbəmərkəzli kommunikativ metodun tətbiqinə həsr olunacaq.

ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi "İngilis dili mütəxəssisi proqramı" çərçivəsində ADPU-da fəaliyyət göstərən ekspert xanımın eyni zamanda konkret fənn üzrə dərslərdə iştirakı, sillabuslar və ingilis dili müəllimliyi ixtisasının tədris planına dair təkliflərinin təqdimatı nəzərdə tutulub.

# Beynəlxalq Loqopedlər Gününə həsr olunmuş "Məzunlarla görüş" adlı tədbir

**Noyabrın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Korreksiyaedici təlim kafedrasının təşkilatçığı ilə universitetdə 14 Noyabr-Beynəlxalq Loqopedlər Gününə həsr olunmuş "Məzunlarla görüş" adlı tədbir keçirilib. Tədbirdə fakültənin müəllim və tələbələri, məzunları iştirak ediblər.**

Tədbiri giriş sözü ilə açan ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev bildirib ki, ADPU ölkəmizin tanınmış və aparıcı ali təhsil müəssisələrindən biridir. ADPU yalnız öz geniş strukturuna görə deyil, həm də qazandığı uğurları, cəmiyyətə verdiyi töhfələri ilə tanınır. Fəaliyyət göstərdiyi müddət ərzində ADPU ölkəmiz üçün 150 mindən çox pedaqoji kadr hazırlayıb. ADPU-da müntəzəm olaraq həm milli, həm də beynəlxalq bayramlar keçirilir. Bu baxımdan, 14 Noyabr-Beynəlxalq Loqopedlər Gününə həsr olunmuş tədbirin keçirilməsi təqdirəlayiqdir.




Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva çıxışında qeyd edib ki ölkəmizdə təhsil sahəsində aparılan genişmiqyaslı islahatlar uğurla davam etdirilir. ADPU-da təhsilin inkişafına xidmət edən islahatlar öz müsbət nəticələrini verir. Fakültə daim öz məzunlarının fəaliyyətini diqqətlə izləyir, onlarla sıx əlaqə saxlayır, əməkdaşlıq əlaqələri qurur. Fakültə inklüziv təhsillə bağlı müxtəlif layihələr, proqramlar, elmi seminarlar, dəyirmi masalar və digər tədbirlər həyata keçirir.

Korreksiyaedici təlim kafedrasının müdiri, dosent Nailə Hüseynova çıxış edərək bildirib ki, ölkə rəhbərliyi xüsusi qayğıya ehtiyacı olan uşaqların cəmiyyətə inteqrasiya olunmasına böyük önəm verir. Bu da öz növbəsində bizim qarşımızda böyük vəzifələr qoyur, məsuliyyətimizi ikiqat artırır. Belə tədbirlərin davamlı keçirilməsi olduqca vacibdir.

Tədbirdə çıxış edən Sumqayıt Dövlət Universitetinin kafedra müdiri Aytəkin Məmmədova onların yüksək səviyyəli mütəxəssis kimi yetişmələrində mühüm rol oynamış fakültə rəhbərliyinə və müəllimlərə təşəkkür edib.

Tədbirdə fakültənin tələbələrinin hazırladıqları videoçarx nümayiş etdirilib.

Sonra fakültənin məzunları-55 saylı inklüziv məktəbin loqopedi Fərəh İmamverdiyeva, 138 saylı inklüziv məktəbin korreksion pedaqoqu Ayşən Nəcəfova, 3 saylı xüsusi təhsil məktəbinin loqopedləri Səbinə Həsənova, Fəridə Tağıyeva, Sumqayıt şəhəri 40 saylı uşaq bağçasının loqopedi Xatirə Əliyeva, 17 saylı nitqi qüsurlu uşaqlar üçün bağçanın loqopedi Raidə Məmmədova, Sağlamlıq imkanları məhdud olan uşaqlar üçün 3 saylı internat məktəbin surdopedaqoqları Sevda Rzayeva, Aytən Məmmədova, 268 saylı xüsusi təhsil məktəbinin loqopedi Reyhan Əhmədova, 202 saylı inklüziv məktəbin korreksion pedaqoqu Günay Cəlilova təqdimatlarla çıxış ediblər. Onların təqdimatları iştirakçılar tərəfindən maraqla qarşılanıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Nurlan Səmədov**

## ADPU-nun əməkdaşları EQAC layihəsi çərçivəsində Litvada keçirilən təlimlərdə iştirak ediblər

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) də tərəfdaşlarından biri olduğu “Azərbaycan universitetlərində Keyfiyyətin təminatı mərkəzlərinin yaradılması və inkişaf etdirilməsi” (EQAC) layihəsi çərçivəsində Litvanın paytaxtı Vilnüs şəhərində növbəti təlimlər keçirilib. 4-11 noyabr tarixlərində baş



tutmuş Litva səfərində ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov və Tədqiqat və inkişaf şöbəsinin mütəxəssisi Xəyyam Cəfərzadə iştirak ediblər.

Avropa Komissiyasının maliyyə dəstəyi ilə Erasmus+ proqramı çərçivəsində Bakı Biznes Universitetinin koordinatorluğu ilə həyata keçirilən bu layihədə Azərbaycan Respublikasının Təhsil Nazirliyi, ölkəmizin 11 ali təhsil müəssisəsi və Avropadan 5 tərəfdaş müəssisə iştirak edir. Qeyd etmək lazımdır ki, ADPU-da son illər rektor, professor Cəfər Cəfərovun rəhbərliyi ilə məhz keyfiyyətə əsaslanan inkişafı təmin etmək məqsədilə tədris, elm, inzibati sahələrdə islahatlar aparılır, müvafiq sənədlər qəbul edilir, beynəlxalq əlaqələr genişləndirilir, professor-müəllim heyətinin, kafedra və fakültələrin illik fəaliyyətlərinin vahid və obyektiv meyarlarla müəyyənləşdirilməsi və s. istiqamətlərdə işlər uğurla həyata keçirilir.

Səfər çərçivəsində 5-6 noyabr tarixlərində Litvanın Ali Təhsildə Keyfiyyətin Təminatı Mərkəzində və tanınmış Mikolo Romerio Universitetində tanışlıq görüşləri keçirilib. Növbəti təlimlər isə 7-10 noyabr tarixlərində Vilnüs şəhərində yerləşən Sosial-Tətbiqi Elmlər Kollecində (SMK) davam etdirilib. Litvada ali təhsildə keyfiyyətin təminatı sahəsində aparıcı mütəxəssislər tərəfindən keçirilən təlimlərdə Azərbaycanın ali məktəblərindən ümumilikdə 36 nəfər iştirak edib. 32 akademik saat çərçivəsində keçirilmiş təlimlərin məqsədi Azərbaycan universitetlərində Keyfiyyətin təminatı mərkəzlərinin iş prinsiplərinin beynəlxalq standartlara uyğunla□dırılması, o cümlədən QPR proqramı vasitəsilə universitetlərin bütün strukturlarının vəzifələrinin və yerinə yetirməli olduğu işlərin dəqiqləşdirilməsi, bu prosesin həyata keçirilməsinin müvafiq sxem və iyerarxiya üzrə onlayn şəkildə izlənilməsidir.

Onu da qeyd edək ki, 9 Noyabr-Dövlət Bayrağı Günü səfər tarixlərinə təsadüf etdiyindən Azərbaycan universitetlərinin nümayəndələri həmin bayramı təlimdən əvvəl Azərbaycan bayraqları ilə himnimizi oxuyaraq qeyd ediblər. Təlimin sonuncu günündə Azərbaycan ali məktəblərinin hər biri sözügedən proqramın köməyi ilə kompüter qrafikası üzrə təmsil etdikləri universitetlərə bağlı hazırladıqları təqdimatları nümayiş etdiriblər. Təlim iştirakçıları üçün nəzərdə tutulmuş müvafiq sertifikatları Bakı Biznes Universitetində keçiriləcək növbəti təlim zamanı təqdim olunması nəzərdə tutulub.

# Xalq şairi Nəriman Həsənzadə ilə görüş

Noyabrın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin və Filologiya fakültəsinin Tələbə Gənclər Təşkilatının birgə təşkilatçılığı ilə Xalq şairi, dramaturq, filologiya üzrə fəlsəfə doktoru, professor, Əməkdar incəsənət xadimi Nəriman Həsənzadə ilə görüş keçirilib.

Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov görüşü giriş sözü ilə açaraq bildirib ki, bu gün universitetimizin kollektivi üçün xoş və sevindirici bir gündür. Xalq şairi, vətənpərvər ziyalı, tanınmış ictimai-siyasi xadim Nəriman Həsənzadədən danışmaq xalq, millət, tarix, bu gün haqqında danışmaq deməkdir. N.Həsənzadə bədii yaradıcılığa ötən əsrin 50-ci illərinin sonlarında başlayıb. Onun əsərlərində xalqın həyatı, ruhu, mənəviyyatı, düşüncələri dolğun əks olunub. N.Həsənzadənin Azərbaycan ədəbiyyatında öz xüsusi yeri, mövqeyi, yaradıcılıq dəst-xətti, üslubu var. O, böyük zəhmət və çətinliklərlə dolu, lakin mənalı və şərəfli bir ömür yolu keçib, cəmiyyətdə öz layiqli yerini tapa bilib. Görkəmli şair, əsl ziyalı, təcrübəli müəllim-alimdir. Onun keşməkeşli və mənalı həyat yolu gənclik üçün layiqli örnəkdir.

Qeyd edək ki, N.Həsənzadə 1931 -ci il fevral ayının 18-də Qazax (indiki Ağstafa) rayonunun Poylu qəsəbəsində anadan olub. Bir yaşında atasını, iyirmi üç yaşında isə anasını itirib. İbtidai və orta təhsilini öz doğma rayonlarında alıb. 1949-1953-cü illərdə Gəncə Dövlət Universitetinin Filologiya fakültəsində ali təhsil alıb. 1954-1956-cı illərdə keçmiş Sovet Ordusu sıralarında hərbi xidmətdə olub. Azərbaycan Yazıçılar Birliyinin göndərişi əsasında Moskvadakı İkiillik Ədəbiyyat Kursunu bitirdikdən sonra Qorki adına Ədəbiyyat İnstitutuna qəbul olunub. 1962-1965-ci illərdə





Bakı Dövlət Universitetinin Azərbaycan ədəbiyyatı tarixi kafedrasının aspirantı olub. 1965-ci ildə "Azərbaycan-Ukrayna ədəbi əlaqələri" mövzusunda dissertasiya müdafiə edərək filologiya elmləri namizədi (indi fəlsəfə doktoru) alimlik dərəcəsi alıb. 1962-ci ildə "Azərbaycan Televiziya və Radio Verilişləri" Qapalı Səhimdar Cəmiyyətində böyük redaktor, sonralar Uşaq və gənclər ədəbiyyatı nəşriyyatında redaktor, ”Azərbaycan gəncləri” qəzetində, ”Azərbaycan” jurnalında şöbə müdiri, 1976-1990-cı illərdə isə ”Ədəbiyyat və incəsənət” qəzetinin baş redaktoru vəzifələrində işləyib. Azərbaycanın və Belarusun fəxri fərmanları ilə təltif edilib. SSRİ yazıçılarının Ədəbiyyat Fondunun Azərbaycan bölməsinin direktoru olub.

N.Həsənzadə bir sıra Avropa və Şərq ölkələrində keçirilən elmi-ədəbi konfransların, poeziya simpoziumlarının, rəsmi dövlət səfərlərinin iştirakçısı olub. 1991-2001-ci illərdə Mətbuat və informasiya nazirinin birinci müavini vəzifəsində çalışıb, bir müddət Mətbuat və informasiya nazirinin vəzifəsini icra edib. 1992-ci ildə Türkiyə Respublikasının Böyük Millət Məclisində xalq deputatı kimi nümayəndə heyəti adından çıxış edib. 2002-ci ildə Beynəlxalq Elmlər Akademiyasının Azərbaycan bölməsinin müxbir üzvü, 2004-cü ildə isə akademiki seçilib. 2004-cü ildə Azərbaycan yazıçılarının XI qurultayında katibliyin qərarı ilə Ədəbiyyat Fondu İdarə Heyətinin sədri təyin edilib.

N.Həsənzadənin bədii yaradıcılığı və ictimai-siyasi fəaliyyəti ölkə rəhbərliyi tərəfindən yüksək qiymətləndirilib. O, “Xalq şairi” fəxri adına layiq görülüb, ”Şərəf” ordeni ilə təltif edilib və Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünə layiq görülüb. Hazırda Azərbaycan Milli Aviasiya Akademiyasının Humanitar fənlər kafedrasının müdiri vəzifəsində işləyir, həmin Akademiyanın Elmi Şurasının üzvüdür.

N.Həsənzadənin yüksək səviyyəli əsərləri xarici mətbuat səhifələrində, o cümlədən “Vətənsiz” poeması 2009-cu ildə Rumıniyada, “Nuru Paşa” poeması isə Türkiyədə dərc edilib. 2009-cu ildə Türkiyədə keçirilən “Kayseri poeziya günləri”ndə şair yüksək mükafatlara layiq görülüb. Həmin il N.Həsənzadə “İlin şairi” elan olunub və ona “Uğur - 2009” diplomu verilib. 2016-cı ildə Cəfər Cabbarlı mükafatına layiq görülüb.

N.Həsənzadə görüşün keçirilməsinə görə universitetin rəhbərliyinə təşəkkür edib. Sonra N.Həsənzadə tələbələrə keçdiyi həyat yolundan, bədii yaradıcılığından danışıb, onların müxtəlif suallarını cavablandırıb, öz şeirlərini söyləyib.

Cənubi Azərbaycandan olan tanınmış şair, “Xudafərin” jurnalının təsisçisi və baş redaktoru Hüseyn Şərqi görüşdə iştirak etməsindən məmnunluq duyduğunu bildirib və şairə ən xoş, ən gözəl arzularını ifadə edib.

Görüşdə tələbə-gənclər musiqi sədaları altında N.Həsənzadənin şeirlərini səsləndiriblər. Görüş hamıda xoş ovqat yaradıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Mənsur Qüdrətoğlu**

# Şair Vahid Əzizlə görüş

Noyabrın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tədris Departamentinin Məzun, koordinasiya və karyera bölməsinin, “Səadət” Şairlər Cəmiyyətinin və Filologiya fakültəsinin Tələbə Gənclər Təşkilatının birgə təşkilatçılığı ilə istedadlı və tanınmış şair, tərcüməçi, publisist, Azərbaycan Yazıçılar Birliyinin üzvü və Azərbaycan Jurnalistlər Birliyinin üzvü Vahid Əzizlə görüş keçirilib.

Görüşdə çıxış edən ADPU-nun Kimya və biologiya fakültəsinin müəllimi, “Səadət” Şairlər Cəmiyyətinin rəhbəri Səadət Abdullayeva, həmin fakültənin II tədris ili tələbəsi İqbal Əsədov bildiriblər ki, dəyərli şairimiz Vahid Əzizlə görüşün keçirilməsi çox sevindiricidir. V.Əziz müasir Azərbaycan poeziyasında öz yeri, mövqeyi və dəst-xətti var. O, çox gözəl şeirlərin, publisistik yazıların müəllifidir.



Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov çıxışında qeyd edib ki, biz bu gün dəyərli bir görüşün iştirakçılarıyıq. V.Əziz böyük istedada malik şair, görkəmli söz ustadıdır. Professor B.Xəlilov noyabrın 23-də 73 yaşı tamam olacaq şairi doğum günü münasibətilə təbrik edib, ona möhkəm cansağlığı, yeni-yeni yaradıcılıq uğurları arzulayıb.

Çıxışında şairin həyat və bədii yaradıcılığı haqqında danışan professor B. Xəlilov bildirib ki, Vahid Əziz 1945-ci il noyabr ayının 23-də Ermənistanın Dərələyəz mahalının Əzizbəyov rayonunun Əzizbəyov kəndində qulluqçu ailəsində anadan olub. Azərbaycanın Tərtər rayonuna köçdükləri üçün orta məktəbi bu rayonda bitirib. Əmək fəaliyyətinə Əli Bayramlı şəhərində (indiki Şirvan şəhəri) “Şirvanneft” trestində başlayıb. Azərbaycan Politexnik İnstitutunda (indiki Azərbaycan Texniki Universiteti) ali təhsil alıb. “Xəbər Mətbuat Agentliyi”ndə müxbir, Bakı Şəhər Partiya Komitəsində Təbliğat və təşviqat şöbəsində təlimatçı, Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsində təlimatçı, Mətbuat bölməsinin müdiri, Azərbaycan Dövlət Mətbuat Komitəsində sədr müavini vəzifələrində çalışıb. Azərbaycan Yazıçılar Birliyinin İdarə Heyətinin katibi olub. Bakı Şəhər İcra Hakimiyyətinin Reklam və Şəhər Tərtibatı Departamentində Reklamların Azərbaycan dilində yazılışına nəzarət bölməsinin müdiri işləyib. İnqilabdan əvvəl görkəmli rus ədiblərinin ermənı - Azərbaycan münasibətlərinə dair yazdıqları əsərlərin yenidən nəşrini bilavasitə təşkil edib. “Oğuz eli” ədəbi-publisistik qəzetinin işıq üzü görməsinə ciddi kömək göstərib.



Bədii yaradıcılığa 1967-ci ildə “Ədəbiyyat və incəsənət” qəzetində çıxan ilk şeiri ilə başlayıb. Həmin vaxtdan dövri mətbuatda müntəzəm çıxış edir. 200-dən çox publisistik məqaləsi və müsahibəsi dərc olunub. Yeni şeirlərlə vaxtaşırı çıxış edir. “Dözmək olmur” adlı şeirlər kitabı rəğbətlə qarşılanıb. Bədii tərcümə ilə də məşğul olur. 40-dan çox mahnısına musiqi bəstələnib. Azərbaycanın rəsmi nümayəndə heyətinin tərkibində dəfələrlə xarici ölkələrdə olub. V.Əzizin yaradıcılığı daim gənclərin diqqət mərkəzindədir.

V.Əziz görüşün keçirilməsinə görə universitetin rəhbərliyinə və bu işdə əməyi keçən hər kəsə təşəkkür edib. Sonra tələbələrə keçdiyi həyat yolundan, bədii yaradıcılığından danışıb, onların müxtəlif suallarını cavablandırıb, öz şeirlərini söyləyib.

Görüşdə Əməkdar artist Vasif Məhərrəmli V.Əzizin şeirlərinə bəstələnmiş mahnıları ifa edib, tələbə-gənclər şeirlərini səsləndiriblər. Görüş hamıda xoş təəssürat yaradıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Günay Ramizqızı**

# Elmi seminar

Noyabrın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) təşkilatçılığı və universitetin Tarix və coğrafiya fakültəsinin tələbəsi Taleh Mirzəyevin layihə rəhbəri olduğu “Gənclərin ermənilərin mənşəyi, dünya və erməni ictimai xadimlərinin ermənilər haqqında fikirləri və beynəlxalq erməni terrorizmi haqqında məlumatlandırılması” layihəsi çərçivəsində ilk elmi seminar keçirilib. Seminarda ekspert qismində dəvət edilmiş Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Arxeologiya və Etnoqrafiya İnstitutunun elmi işçisi, fiziki antropoloq, Azərbaycanda müasir dövrdə paleoantropologiya sahəsində tədqiqatlar aparan Vüsal Həsənov “Antropoloji dəlillər ermənilərə yox deyir!” mövzusunda çıxış edib. Tədbirdə ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Ümumi işlər üzrə prorektoru Əbdül Xalıqov, prorektor köməkçisi Sahil Qələndərov və elektron seçim prosesindən keçərək iştirak hüququ qazanan 100 nəfər tələbə iştirak edib.

Tədbiri giriş sözü ilə açan Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev qonağı və iştirakçı tələbələri universitetin rəhbərliyi adından salamlayıb. Professor F.Rzayev mövzunun aktuallığı, gələcəyin qurucuları olan tələbələrin bu sahədə ciddi elmi dəlillər, yanaşmalar və davranış kodeksinə yiyələnmələrinin əhəmiyyətini xüsusi vurğulayıb və tələbələri bu müzakirələrdə fəal olmağa səsləyib.




Ekspert Vüsal Həsənov dünyadakı əsas makroirqlər, irqlərin antropoloji tipləri, tiplərin əsas fizioloji əlamətləri, müqayisəli təhlilləri ilə bağlı geniş məlumat verib, vaxtilə professor Rəbiə Qasımovanın bu barədə əldə etdiyi elmi nəticələr haqqında danışaraq əyani nümunələr və elmi dəlillərlə Qafqaz ərazisində qədim dövrün bütün mərhələlərində tapılan insan qalıqlarının kaspi antropoloji tipində, digər dövrlərdə isə bu nisbətin alpin, pont və s. kimi Qafqaz və turanit tiplərində təmsil olunduğunu qeyd edib. Bu fakt isə birbaşa olaraq ermənilərin antik dövrdən bəri Qafqazın yerli sakinləri olmaları iddialarının rədd edən ciddi elmi dəlildir. Çünki ermənilər sadalanan tiplərin heç birində təmsil olunmur. Ermənilər dinarik antropoloji tipinə aiddirlər.

Sonra seminar interaktiv şəkildə davam edib, tələbələr mövzu ilə bağlı öz fikir və suallarını səsləndiriblər.

Qeyd edək ki, layihənin icrasında məqsəd gənclərin tarixi faktlar, ölkəmizin tarixi və erməni problemi ilə bağlı məlumatlılıq səviyyəsinin əməli və elmi şəkildə artılması, Vətən tarixini dərindən mənimsəmək, Vətənə sevgi ruhunu yüksəltmək və beynəlxalq informasiya mübarizəsində gənclərimizin elmi, milli-ideoloji hazırlıq səviyyəsinin yüksəlməsi, əməli işlər görülməsinin təminə töhfə verilməsidir. Layihənin əsas iştirakçıları tələbələr, xüsusən, tədqiqatçılıq və xarici ölkələrdə elmi, siyasi tədbirlərdəki mövzu ilə əlaqəli debatlara qatılan gənclərdir. Layihə 5 bir-birinə bağlı seminar halında həyata keçiriləcək və iştirakçılar hər bir seminarda iştirak edəcəklər.

Silsilə seminarların sonunda xüsusi hazırlanmış video, elektron və buklet materialları nümayiş olunacaq və iştirakçılara paylanacaq. Layihənin yekununda iştirakçılar sertifikatlarla təltif ediləcəklər.

# Əjdər Əbdülhüseyn oğlu Ağayev

Azərbaycanın elm və təhsil ictimaiyyətinə ağır itki üz vermişdir. Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü, istedadlı və tanınmış pedaqoq-alim, pedaqogika üzrə elmlər doktoru, professor, Əməkdar müəllim, şair, nasir, publisist, tənqidçi, Azərbaycan Yazıçılar Birliyinin üzvü və Azərbaycan Jurnalistlər Birliyinin üzvü, Azərbaycan Təhsil Şurasının təsisçisi, ilk sədri və fəxri sədri Əjdər Əbdülhüseyn oğlu Ağayev uzun sürən xəstəlikdən sonra 81 yaşında vəfat etmişdir.

Əjdər Ağayev 1937-ci il oktyabr ayının 10-da Neftçala rayonunun Qırmızıkənd kəndində anadan olmuşdur. Burada kənd yeddiillik məktəbini, Salyan rayonunda orta məktəbi bitirmişdir. 1955-1960-cı illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) Tarix-filologiya fakültəsində ali təhsil almışdır. 1960-1965-ci illərdə Salyan rayonunun məktəblərində müəllim işləmişdir. 1965-1969-cu illərdə Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun (indiki Azərbaycan Respublikasının Təhsil İnstitutu) aspiranturasında təhsil almışdır. Bu institutda Əhməd Seyidovun rəhbərliyi ilə "Fərhad Ağazadənin pedaqoji görüşləri" mövzusunda namizədlik dissertasiyası müdafiə etmiş, sonra elmi işçi, baş elmi işçi, bölmə müdiri, şöbə rəisi, direktorun elmi işlər üzrə müavini vəzifələrində çalışmışdır . "Azərbaycan ictimai fikrində şəx-



siyyətin formalaşması" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. 1974-1981-ci illərdə "Azərbaycan məktəbi" jurnalının və onun əlavə nəşr edilən məcmuələrinin baş redaktoru olmuşdur. Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda Pedaqogikanın nəzəriyyəsi və tarixi şöbəsinin müdiri, Lənkəran Dövlət Universitetində Pedaqogika və psixologiya kafedrasının müdiri vəzifələrində çalışmışdır. Azərbaycan Respublikasının Təhsil Nazirliyi nəzdində Pedaqogika və psixologiya elmləri üzrə Elmi-Metodiki Şuranın sədri, Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının Pedaqogika və psixologiya elmləri üzrə ekspert komissiyası sədrinin müavini olmuşdur. 500-dən çox elmi əsərin, 40 kitabın, monoqrafiya və dərsliyin, proqram və metodik tövsiyənin, 600-dən çox elmi-kütləvi, publisistik məqalənin, 10 bədii kitabın müəllifidir. Əsərləri rus, ingilis, ukrayna, belarus, başqırd dillərində çap olunmuşdur. Azərbaycanda pedaqoji jurnalistikanın, xüsusilə, pedaqoji televiziya jurnalistikasının yaradıcılarından biri, pedaqogikanın nəzəriyyəsi və tarixi problemləri üzrə fundamental tədqiqatların müəllifidir. Vətəndaşlıq tərbiyəsi, şəxsiyyətin formalaşması, sahiblik hissi tərbiyəsi, məktəblərdə Vətənə sədaqət tərbiyəsi, məktəblərdə vətəndaşlıq borcunun tərbiyə edilməsi kimi problem mövzuların pedaqoji aspektdə ilkin tədqiqi sahəsində əvəzsiz xidmətləri var. Tədqiqatlarla yanaşı, ölkəmizdə elmi-pedaqoji kadr hazırlığında müstəsna rolu olmuşdur. Bacarıqlı elm və təhsil təşkilatçısı olan Əjdər Ağayevin zaman-zaman ölkəmizin müxtəlif ali təhsil müəssisələrində pedaqogikadan oxuduğu maraqlı və yüksək səviyyəli mühazirələr gənclərin təlim-tərbiyəsinə səmərəli təsir göstərmişdir.

Əjdər Ağayev elmi-pedaqoji fəaliyyətlə yanaşı, bədii yaradıcılıqla da məşğul olmuşdur. Bədii yaradıcılığa ötən əsrin 50-ci illərindən başlamışdır. İlk hekayəsi olan "İlk və son mahnı" 1956-cı ildə "Azərbaycan pioneri" qəzetində, "Bir də çal o mahnını" adlı ilk şeri isə 1957-ci ildə "Azərbaycan gəncləri" qəzetində dərc olunmuşdur. 200-dək şerinə mahnı bəstələnmişdir.

1999-cu ildə Türkiyə ixtisas kursunda, 2001-ci ildə Türk xalqlarının VIII qurultayında və UNİSEF-in 2001-ci ildə Macarıstanda təşkil etdiyi konfransda iştirak etmişdir. Akademik Mehdi Mehdizadə adına mükafatın və "Araz" ali ədəbi mükafatın laureatıdır.

Görkəmli və təcrübəli elm və təhsil xadimi olan Əjdər Ağayev Azərbaycan Dövlət Pedaqoji Universitetində keyfiyyətli təhsil imkanlarının yaradılmasında və yüksək səviyyəli mütəxəssislərin işə cəlb edilməsində fəal iştirak etmiş, bütövlükdə universitetdə həyata keçirilən islahatlara, yeniliklərə hərtərəfli dəstək vermişdir.

Böyük alim, dəyərli ziyalı, ləyaqətli vətəndaş Əjdər Ağayevin əziz xatirəsi onu tanıyanların qəlbində həmişə yaşayacaqdır.

**Allah rəhmət eləsin!**
**ADPU-nun rəhbərliyi və kollektivi**

## Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsində elmi seminar

Noyabrın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Musiqi və onun tədrisi metodikası kafedrasının elmi seminarı keçirilib. Seminarda professor Minarə Dadaşova "Müasir Azərbaycan musiqisində polifonik yanaşma" və pedaqogika üzrə fəlsəfə doktoru, baş müəllim Nərmin Kamilova "Qacarlar və incəsənət" mövzusunda məruzələrlə çıxış ediblər.

Öncə fakültənin dekanı, dosent Laçın Həsənova seminar iştirakçılarını salamlayıb və onlara uğurlar arzulayıb. Fakültənin tələbələri Nazim Mirzəyev, Elvin Rəsulov və Hüseyn Rəhimli birgə ərsəyə gətirdikləri Azərbaycanın Milli Qəhrəmanı Mübariz İbrahimova həsr olunmuş filmi təqdim ediblər. Film rəğbətlə qarşılanıb və tələbələrə gələcəkdə bu fəaliyyətlərini genişləndirmələri tövsiyə olunub.

Professor Minarə Dadaşova "Müasir Azərbaycan musiqisində polifonik yanaşma" mövzusunda çıxış edib. O, çıxışında bəstəkar Elnarə Dadaşovanın yeni bəstələdiyi fuqalar haqqında məlumat verərək həmin əsərdən müxtəlif nümunələri ifa edib.

Sonra kafedranın baş müəllimi Nərmin Kamilova müxtəlif videosüjetlər və slaydlarla Qacarlar və onların incəsənətdə rolundan bəhs edib. Seminarda F.Əmirov adına Azərbaycan Dövlət Mahnı və Rəqs Ansamblının solisti Aydan Kamilova "Miniatürlər" və "Sarı gəlin" rəqslərini təqdim edib.



Seminarda Qacarlar nəslinin nümayəndəsi Kamilə xanım Qarabağlı çıxış edərək Fransa, Böyük Britaniya və Rusiya müzeylərində saxlanılan Qacarlar xanədanlığına aid olan incəsənət əsərləri barədə məlumat verib.

Sonda fakültənin dekanı, dosent Laçın Həsənova məruzəçilərə maraqlı çıxışlarına görə öz təşəkkürünü bildirib.

## İbtidai təhsil fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası

Noyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası keçirilib. Fakültənin dekanı, Elmi Şuranın sədri, pedaqogika üzrə elmlər doktoru, professor Fərrux Rüstəmov iclası giriş sözü ilə açaraq son illər rektor, professor Cəfər Cəfərovun rəhbərliyi ilə universitetdə infrastruktur, təhsilin məzmunu və müəllimlərin peşəkarlığının artırılması sahəsində görülən məqsədyönlü işlərdən danışıb. Universitetin professor-müəllim heyətinin əməyinin stimullaşdırılması, peşəkarlığının artırılması məqsədilə onların illik fəaliyyətinin dəyərləndirilməsinə toxunub, yeni qiymətləndirmə formasının təlim keyfiyyətinin yüksəldilməsində mühüm rol oynayacağını bildirib.



Fakültənin Elmi Şurasının iclasında Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov iştirak edib. O, ADPU-da professor-müəllim heyətinin, kafedraların və fakültələrin illik fəaliyyətinin Reytinq qiymətləndirilməsi ilə bağlı geniş məlumat verib və fakültə əməkdaşlarının suallarını cavablandırıb.

## Kimya və biologiya fakültəsində tələbələrin elmi fəaliyyətə cəlb edilmələrinə xüsusi diqqət yetirilir

Kimya və biologiya fakültəsində tələbələrin Tələbə Elmi Cəmiyyətinin (TEC) xətti ilə elmi-tədqiqat işlərinə cəlb edilmələri istiqamətində fəaliyyət təsdiq edilmiş iş planına uyğun şəkildə həyata keçirilir. Belə ki, TEC-in Əsasnaməsi və görüləcək işlər haqqında kafedralarda müzakirələr aparılıb. Bununla yanaşı, tələbələrin elmi-tədqiqat işlərinə cəlb edilmələrini stimullaşdırmaq istiqamətində fəaliyyət göstərilir. Tələbələrə elmi-tədqiqat işi aparmağın faydaları, bu yolla tədqiqatçılıq bacarıqlarının inkişafı, həmçinin bu fəaliyyətin gələcək peşə karyerasına təsirləri haqqında məlumatlar verilib. Eyni zamanda Yeni bioloji aktiv birləşmələr elmi-tədqiqat laboratoriyasında tələbələrin qazandırdıları uğurları əks etdirən stend yaradılıb. Stenddə tələbələrin respublikada və xaricdə təşkil edilən konfranslardakı uğurlarını təsdiqləyən sertifikatların göz önündə olması da real fakt kimi öz təsirini göstərir. Stenddə tələbələrin sertifikatları ilə yanaşı, müəllimlərin də nəticələrini əks etdirən sertifikatların olması tələbələrdə bugünkü fəaliyyətlərinin hansı uğurlara yol aça bilməsi haqqında real təsəvvür yaradır.

Qeyd etmək lazımdır ki, TEC-in fəaliyyəti fakültə rəhbərliyi tərəfindən dəstəklənir. Kafedralarda TEC-in dərnəkləri fəaliyyət göstərir. Dosent Laləndə Ağayeva, kimya üzrə fəlsəfə doktoru, baş müəllim İsa Cəfərov, kimya üzrə fəlsəfə doktoru, baş müəllim Gülnarə İsmayılova, pedaqogika üzrə fəlsəfə doktoru, müəllim Pərvin Qafarova dərnək rəhbərləri kimi kafedralarda TEC-in fəaliyyətini təşkil edirlər.

Hazırda Kimya və biologiya fakültəsinin professor-müəllim heyəti tərəfindən ümumilikdə 93nəfər tələbənin TEC-in xətti ilə elmi-tədqiqat işlərinə cəlb edilmələri haqqında sənədlər təqdim edilib. Məlumatlar fakültə üzrə dosent Alı Namazovun daha çox tələbəyə elmi rəhbərlik etdiyini göstərir. Bununla yanaşı, 56 nəfər tələbə olimpiadaya hazırlıq məqsədilə təşkil edilən kurslarda biliklərini möhkəmləndirməyə çalışırlar.

Tələbələrə və onların rəhbərlərinə uğurlar arzulayıram.

**Rəhimə Məmmədova,**
**Kimya və biologiya fakültəsi üzrə TEC-in sədri, dosent**

## ADPU-nun Şəki Filialının Elmi Şurasının növbəti iclası

Noyabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialının Elmi Şurasının geniş tərkibdə növbəti iclası keçirilib. İş planına uyğun olaraq Şura iclasında aşağıdakı məsələlərin müzakirəsi keçirilib:

***1. 2018-ci təqvim ilində filialın kafedraları üzrə elmi-tədqiqat işlərinin yerinə yetirilməsi vəziyyəti və qarşıda duran vəzifələr haqqında.***

***2. Filialın kafedraları üzrə elmi seminarların planlaşdırılması və keçirilməsi vəziyyəti haqqında.***

***3. Filialın Təbiət fənləri və onların tədrisi metodikası kafedrasında tədris prosesinə və elmi-tədqiqat işlərinə rəhbərliyin təşkili vəziyyəti haqqında.***

***4. Tələbə və tədrisin idarə olunması şöbəsinin fəaliyyəti haqqında.***

Elmi Şuranın iclasını giriş sözü ilə açan filialın direktoru, riyaziyyat elmləri doktoru, dosent Rafiq Rasulov ölkədə həyata keçirilən davamlı təhsil islahatları, ölkə Prezidenti cənab İlham Əliyevin "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması haqqında" Sərəncamı, həmin Sərəncamın icrası ilə bağlı təsdiq edilmiş "Dövlət Proqramı" haqqında məlumat verib. Elmi Şuranın sədri R.Rasulov qeyd edib ki, proqramın əsas hədəfi ən qabaqcıl elmi naliyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından yararlanaraq ölkəmizdə yeni nəsil mütəxəssislərin yetişdirilməsi, Azərbaycan ali təhsil sisteminin məzmun və keyfiyyət göstəricilərinin beynəlxalq ikili diplom proqramları ilə müasirləşdirilməsidir.

Gündəlikdəki I məsələ ilə əlaqədar filialın Elmi işlər üzrə direktor müavini, dosent Nuralı Çələbiyev hesabat məruzəsi ilə çıxış edib. O, 2018-ci ildə filialın kafedraları üzrə yerinə yetirilmiş elmi-tədqiqat işləri haqqında ətraflı məlumat verib. Qeyd olunub ki, 2018-ci ildə filialın 98 nəfər professor-müəllim heyətindən 65 nəfəri elmi-tədqiqat fəaliyyətinə cəlb olunub. Əməkdaşlar tərəfindən il ərzində 1 dərs vəsaiti, 1 metodik vəsait, 3 monoqrafiya, 65 elmi məqalə ( onlardan 6-sı xaricdə dərc olunub),45 beynəlxalq və respublika konfrans tezisi, 5 fənn proqramı hazırlanaraq nəşr edilib.

Gündəlikdəki II məsələ haqqında məlumat verən dosent N.Çələbiyev bildirib ki, son 3 ildə filialda elmi-innovativ seminarların keçirilməsinə diqqət artırılıb. Kafedraların iş planlarına uyğun olaraq, hər kafedra üzrə tədris ili ərzində 10 elmi seminarın keçirilməsi, ayrı-ayrı kafedralar üzrə 10-16 mövzuda təqdimatların müzakirəsi nəzərdə tutulub. İndiyədək hər kafedra üzrə 2-3 elmi seminar keçirilib.

Gündəlikdəki III məsələ haqqında məlumatla çıxış edən Təbiət fənləri və onların tədrisi metodikası kafedrasının müdiri, professor Firədun İbrahimov rəhbərlik etdiyi kafedrada cari tədris ilində tədris və elmi istiqamətlərdə planlaşdırmanın təşkili, həyata keçirilən tədbirlər, əldə edilmiş nəticələr və qarşıda duran vəzifələr haqqında ətraflı məlumat verib.

Sonuncu məsələ ilə əlaqədar Tələbə və tədrisin idarə olunması şöbəsinin müdiri, baş müəllim Yeganə Rəhimova hesabatla çıxış edib.

Elmi Şura gündəlikdəki cari məsələləri də müzakirə etdikdən sonra müvafiq qərarlar qəbul edib.

## Fizika və texnologiya fakültəsində növbəti elmi seminar



Noyabrın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsində növbəti elmi seminar keçirilib. Seminarı giriş sözü ilə fakültənin dekanı, dosent Arzu Daşdəmirov açıb. Fakültə elmi seminarının rəhbəri, dosent Aydın Ələkbərov çıxış üçün sözü Türkiyənin "Vestel" Şirkətinin və Müdafiə Nazirliyinin əməkdaşı, kimya elmləri doktoru, professor Sadiq Quliyevə verib.

Professor Sadiq Quliyev müasir dövrümüz üçün çox aktual olan "Polielektrolit membranlı yanacaq elementləri" mövzusunda ətraflı çıxış edib.

Çıxışdan sonra fakültənin əməkdaşları - professor Şükür Əlizadə, professor Edil Eyvazov, dosent Oqtay Həsənov, dosent Cahangir Hüseynov, baş müəllim Ağaxəlil Əliyev mövzu ilə bağlı məruzəçiyə müxtəlif suallarla müraciət ediblər.

Seminarın sonunda fakültənin dekanı, dosent Arzu Daşdəmirov məruzəçiyə dərin məzmunlu, maraqlı çıxışına görə təşəkkür edib.

## ADPU-nun Ağcabədi Filialında 12 Noyabr - Konstitusiya Günü münasibətilə tədbir

**Noyabrın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında 12 Noyabr-Konstitusiya Günü münasibətilə "Əsas insan, vətəndaş hüquqları və azadlıqları" mövzusunda dəyirmi masa keçirildi.**



Əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi.

Tədbiri giriş sözü ilə açan filialın Tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanov müstəqil Azərbaycan Respublikasının qanunverici aktı olan Konstitusiyanın yaranmasından ötən 23 illik müddət ərzində ölkə həyatında müsbət mənada baş verən dəyişikliklərdən danışdı.

Sonra məruzə dinlənildi.

"Əsas insan, vətəndaş hüquqları və azadlıqları" mövzusunda məruzə edən filialın Tərbiyə işləri üzrə direktor müavini, dosent Mahir Səlimov dövlətçiliyimizin mühüm məsələsi olan Konstitusiyanın qəbulundan və bunun tarixi əhəmiyyətindən danışdı. Azərbaycan Respublikasının Konstitusiyasını bölmə, fəsil və maddələr üzrə şərh edən məruzəçi, əsasən diqqəti üçüncü bölmədə öz əksini tapan insan hüquqları və azadlıqları məsələsinə çəkdi. Ölkə Konstitusiyasının təxminən üçdə birini əhatə edən insan amilinin dövlətimizin qanunverici aktında öz əksini tapmasını həmin sənədin demokratik mahiyyəti və hüquqi dövlət quruculuğu ilə əlaqələndirdi. Qeyd olundu ki, Azərbaycan Konstitusiyasının daxili mahiyyətini demokratiya, hüquqi və sosial dövlət quruculuğu, vətəndaşların hüquq və azadlıqlarının müdafiəsi kimi dəyərlər təşkil edir.

Dosent M.Səlimov məruzəsini Azərbaycan Respublikası Konstitusiyasının müəllifi, ulu öndər Heydər Əliyevin vaxtilə dediyi "Bu gün ən mühüm vəzifə Konstitusiyanı daha dərindən mənimsəmək və onun verdiyi təlimatlardan bəhrələnməkdən ibarətdir" sözləri ilə sonlandırdı.

Məruzə ətrafında çıxışlar dinlənildi.

Filialın İctimai, təbiət fənləri və onların tədrisi metodikası kafedrasının dosenti Məhəmməd Hüseynov, Xüsusi və ümumelmi fənlər kafedrasının müdiri, dosent əvəzi Tahir Kərimli, Riyaziyyat, informatika və onların tədrisi metodikası kafedrasının müdiri, dosent Sahib Zeynalov məruzə ətrafında çıxış edərək müstəqil Azərbaycan Respublikası Konstitusiyasının qəbulundan sonra əlavə və dəyişikliklərin edilməsi faktlarına toxundular. Qeyd olundu ki, Azərbaycan Respublikasının Avropa məkanına inteqrasiyası və eləcə də hüququn müasir inkişaf istiqamətləri ölkədə Konstitusiya islahatlarının aparılması və Əsas Qanunun daha da təkmilləşdirilməsi zərurətini yaratmışdır. Azərbaycan Respublikası Konstitusiyasına edilmiş dəyişikliklər Azərbaycanın hüquq sisteminin dünyanın inkişaf etmiş dövlətlərinin hüquq sisteminə və beynəlxalq hüquq normalarına uyğunlaşdırılması mahiyyət etibarilə ölkə vətəndaşlarının hüquq və azadlıqlarının daha səmərəli müdafiə edilməsi məqsədlərinə xidmət edir.

Filialın Pedaqoji fakültəsinin "Riyaziyyat və informatika müəllimliyi" ixtisası üzrə təhsil alan tələbələri - Gülbəs Şirinova və Səbinə Şahverənova tələbə- gənclər adından çıxış edərək tədbir iştirakçılarını bayram münasibətilə təbrik etdilər və gələcək əməli fəaliyyətlərində qanunun aliliyinin keşiyində dayanacaqlarına söz verdilər.

## ADPU-nun Şamaxı Filialında 12 Noyabr - Konstitusiya Gününə həsr olunmuş dəyirmi masa



**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında 12 Noyabr-Konstitusiya Gününə həsr olunmuş dəyirmi masa keçirilib. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi və respublikanın Konstitusiya quruluşunun və ərazi bütövlüyünün uğrunda şəhid olan soydaşlarımızın əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayıb.**

"Azərbaycan Respublikasının Konstitusiyası və Heydər Əliyev" adlı videoçarx nümayiş olunduqdan sonra Tədris və elmi işlər üzrə direktor müavini, fəlsəfə doktoru Şasəddin Mikayılov əlamətdar gün münasibətilə dəyirmi masa iştirakçılarını təbrik etdi. O, Azərbaycan dövlətinin öz müstəqilliyini 1991-ci ildə yenidən bərpa etməsinə baxmayaraq, ali qanunlar toplusu olan Konstitusiyanın qəbul edilməməsinin səbəbini o vaxtkı hakimiyyət nümayəndələrinin səriştəsizliyi ilə əlaqələndirdi. Məhz belə çətin tarixi bir dövrdə yenidən hakimiyyətə gələn ümummilli lider Heydər Əliyevin müdrik siyasəti nəticəsində Azərbaycanın ilk Konstitusiyası qəbul edildi.

Humanitar və xüsusi fənlər kafedrasının baş müəllimi Fəxrəddin Məmmədov çıxışında qeyd etdi ki, artıq 23 ildir ki, Azərbaycan Respublikasının Konstitusiyası milli dövlətçilik ənənələrinə, ölkədə dərinləşən islahatlara, xalqın tərəqqisinə xidmət edir. O, Prezident İlham Əliyevin "Azərbaycan Konstitusiyası böyük potensiala malikdir və xalqımızın firavanlığına xidmət edir" ifadəsini də iştirakçıların diqqətinə çatdırdı.

Tələbələrdən Toğrul Musayev, Nübar Nəhmətova, Fəridə Hüseynova, Şəms Şakirli, Aygün Vahabova, Aytac Süleymanova, Asəf Niyazov Azərbaycan Respublikasının Konstitusiya quruculuğu tarixi, Azərbaycan Respublikasının Konstitusiyası və ulu öndər Heydər Əliyev, Konstitusiya layihəsinin hazırlanması, qəbul edilməsi və tarixi əhəmiyyəti, Azərbaycan Respublikasında xalq hakimiyyəti, insan və vətəndaş hüquq və azadlıqları, Azərbaycan Respublikasında dövlət hakimiyyətinin bölünməsi prinsipləri mövzularındada çıxışlar etdilər. Çıxışçılar qeyd etdilər ki, Azərbaycan Konstitusiyasının özünəməxsus bir çox üstün cəhətləri vardır. Bunlardan ən əsası odur ki, Konstitusiya dünyanın ən mütərəqqi dövlətlərinin təcrübəsini özündə birləşdirir. Bu qanunun əsasını dövlətin müstəqilliyinin, suverenliyinin qorunması, demokratik quruluşa təminat vermək, vətəndaş cəmiyyətinin bərqərar edilməsinə nail olmaq, hüquqi dövlət qurmaq və s. mühüm məqamlar təşkil edir.

Sonda tələbələr qeyd etdilər ki, müasir gənclərin borcu Konstitusiya ilə müəyyən olunmuş hüquq və vəzifələrini bilmək və başqalarının hüquqlarına hörmətlə yanaşmaqdır.

## ADPU-nun Quba Filialında "Öz şöləni kəşf et!" adlı tədbir



**Noyabrın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında "Öz şöləni kəşf et!" adlı növbəti tədbir keçirilib. Tədbirdə filialın "Təhsildə sosial-psixoloji xidmət ixtisasının" IV tədris ili tələbəsi, istedadlı şair, gənc saz ifaçısı Amil Bəxtiyarın yaradıcılığı müzakirə olunub.**

Amil Bəxtiyarın heca və əruz vəznində yazdığı Vətən məhəbbətini, sevgini, azadlığı tərənnüm edən şeirləri tələbələr tərəfindən səsləndirilib. Tələbələr Qeyrət Əmirov, Şəmsiyə Rüstəmova, Aytən Məmmədova və digərlərinin səsləndirdikləri "İnş-Allah azad olar əsir Qarabağımız", "Gözlərin nə yaman qəribə baxır", "Gülüm sənə əlvida", "Gəzər" və bu kimi digər şeir və qəzəlləri tədbir iştirakçıları tərəfindən maraqla qarşılanıb.

Tədbirdə Amil Bəxtiyar qədim Azərbaycan musiqi aləti olan sazda müxtəlif musiqilər də ifa edib.

Tədbirdə çıxış edən filialın Tədris və elmi işlər üzrə direktor müavini, tarix üzrə fəlsəfə doktoru İsmayıl Mahmudov, Tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, dekan müavini Nübar Bayramova, Ədəbiyyat və dillər kafedrasının müəllimi Günəş Xudayarova, Pedaqoji və ictimai fənlər kafedrasının müəllimi Mürvət Əliyev gənc yazarı təbrik edib, ona uğurlar arzulayıblar.

Sonda Amil Bəxtiyara filialın direktoru, professor Əli Allahverdiyev tərəfindən Fəxri Fərman təqdim olunub.

Redaktor: Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az Fotolar Nurlan Səmədovundur Şəhadətnamə № 191

Sifariş: 3672 Sayı: 1500 Çapa imzalanıb: 30.11.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.